AZƏRBAYCAN MİLLİ ELMLƏR AKADEMİYASI
MƏHƏMMƏD FÜZULİ ADINA ƏLYAZMALAR İNSTİTUTU

**HACI HƏSƏN HÜSEYNİ**

# MÜQƏDDƏS ZİLHİCCƏ BAYRAMLARI

**BAKI-2019**

***AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun Elmi şurasının fevral 2019-cu il tarixli (2 saylı) iclasının qərarı ilə çap olunur.***

Nəşrə hazırlayan
və ön söz müəllifi:
**SONA XƏYAL**

Redaktor:
**VƏRAĞA ALMASOV**
filologiya üzrə fəlsəfə doktoru

Rəyçilər:
**TAHİRƏ HƏSƏNZADƏ**
tarix üzrə elmlər doktoru
**ZƏKİYYƏ ƏBİLOVA**
fəlsəfə üzrə elmlər doktoru

**Hacı Həsən Hüseyni. Müqəddəs Zilhiccə bayramları**
Bakı, “Ecoprint”, 2019, 128 s.

ISBN 978 9952 29 108 7

# MÜQƏDDƏS BAYRAMLAR

İslam tarixində kədərli şəhadət günləri ilə yanaşı bir sıra müqəddəs bayramlar da vardır ki, müsəlmanlar onları sevinclə qarşılayıb, təntənə ilə qeyd edirlər. Bu cəhətdən hicri-qəməri təqviminin zilhiccə ayı daha zəngindir. Belə ki, bu aya dörd müqəddəs bayram düşüb.

Zilhiccənin ilk gününə təsadüf edən Həzrəti-Əli (ə) ilə Fatimeyi-Zəhranın (s.ə) izdivac günü hər bir evdə ailəvi bayram kimi keçirilir. Bu gün məscidlərdə, mədrəsələrdə və digər dini ocaqlarda təntənəli bayram süfrələri təşkil edilir, xonçalar tutulur, sürudlar oxunur.

Zilhiccənin 10-a təsadüf edən Qurban bayramı ümumdünya bayramı hüsab olunur. Həmin gün dünyanın hər ölkəsindən Məkkəyə karvan-karvan insan gəlir və hac əməllərini yerinə yetirməyə səy edir, qurban kəsirlər. Öz məmləkətində qalanlar isə öz evlərində və ya dini ocaqlarda qurban kəsib camaata paylayırlar.

Zilhiccənin 18-də təsis edilən Ğədir-Xum bayramı Ğədir-Xum çölündə Peyğəmbər (s) tərəfindən Allahın əmri ilə Həzrəti-Əlinin (ə) xəlifə seçildiyi gündür. Bu gündə Peyğəmbər (s) vida həccindən geri dönərkən Cəbrailin vəhyinə görə bütün hacıları Ğədir-Xumda saxlamış, xütbə oxumuş, sonra Əlini (ə) öz yerinə canişin seçdiyini bildirmişdir. Elə həmin anda Cəbrail yeni bir ayə ilə yerə enmiş və Allahın İslam dinini kamil din qərar verməsi xəbərini Peyğəmbərə (s) çatdırmışdır.

Bəzi tarix kitablarında qurban bayramı zilhiccənin 17-si kimi qeyd olunsa da, bu il Ğədir-Xum bayramını Zilhiccənin

18-də keçirdik. Biz bu günü müqəddəs Məşhəd şəhərində İmam Rzanın hərəmində qeyd etdik. Hərəmdə olduqca böyük izdiham var idi. Azərbaycandan daha çox karvan gəlmişdi. Hərəm gözəl bəzədilmişdi. Hər səhndə sürud oxuyan ansambllar bayrama bir az da rəng qatırdılar. Əllərində gül yelləyən insanların üzlərində sevinc, gözlərində işıq seli var idi. Gecə saat 11-dən sonra insanlar dağılışmağa başladılar. Biz mehmanxanaya gəlib orada bayram süfrəsi açdıq, süfrəni xonçalarla bəzədik. Ğədir-Xum tarixi ilə bağlı hədislər danışıldı, sürudlar oxundu. Hətta xanımlar əllərinə xına da yaxdılar. Sonra yığışıb gecəni keçirmək üçün yenidən hərəmə qayıtdıq. Rəngbərəng işıq seli altında keçirilən təntənəli bayram indiyə kimi gözlərimin önündən getmir. Adam heç oradan evə qayıtmaq istəmirdi...

Zilhiccənin 25-ə təsadüf edən Mübahilə günü də İslam tarixində böyük bayram kimi qeyd olunur. Bu Quranda gələn mübahilə ayəsi ilə məşhur olan bayramdır.

İslam tarixindəki bayramlar haqqında bir çox dini kitablarda məlumat verilmiş, onların özəlliklərindən danışılmışdır. Hətta ayrı-ayrı bayramlar haqqında kitabçalar, broşurlar da çap olunmuşdur. Hacı Həsən Hüseyninin “Müqəddəs zilhiccə bayramları” adlanan bu kitabı isə adından da göründüyü kimi bir ayda qeyd olunan dörd bayrama həsr olunmuşdur.

Hacı Həsən Hüseyninin imzası oxuculara çoxdan tanışdır. Onun əsərlərində Allah kəlamlarını, Peyğəmbər (s) hədislərini rəhbər tutaraq, Əhli-beytin (ə.m.) həyat yolunu, yaşam tərzini əks etdirən əsərləri Həzrəti-Əlinin (ə) nəhəngliyini, dahiliyini, eyni zamanda məsumluğunu öz dərin sevgisi işığında aydınladan “Parlaq ulduz”, İmam Hüseynin (ə) mövludundan şəhadətinə qədər baş verən hadisələri əks etdirən, Kərbəla faciəsinin səbəblərini və mahiyyətini açıqlayan

“Xuda Hüseynin Aşiqi”, bir sıra klassik şairlərin və Qurbani Məclisinin bəzi üzvlərinin Aşıq Qurbaninin “Əli” və “Ya Mürtəza Əli” rədifli şeirlərinə yazdıqları nəzirələrin toplandığı “Ya Əli”, Nizami Gəncəvidən tutmuş müasir şairlərimizə qədər bir çox görkəmli söz ustalarının Məhəmməd peyğəmbərə (s) həsr etdikləri çox dəyərli şeirlərin toplandığı “Gizli qalmış xəzinə”, Həzrəti-Əlinin (ə) həyatını, nübüvvət və imamətin mahiyyətini, İmam Əlinin (ə) Quranda tərifini əks etdirən, bir sıra şairlərin Əliyə (ə) həsr olunmuş şeir və poemalarının daxil edildiyi “Həzrəti-Əli (ə) müxtəlif baxışlarda”, Quran ayələrinin şərhini, şəriət məsələlərini, 14 məsumun (ə.m.) və övliyaların həyatını əks etdirən, namaz və oruclardan, bəhs edən, İslamda ailəyə münasibəti açıqlayan, cənazə, ehsan, ölüləri ziyarət ilə əlaqədar məsələləri işıqlandıran məqalələrin toplandığı “Sığın Haqq dərgahına”, “Bismilləh” ayəsindəki “bə” hərfinin altında olan nöqtənin sirrini Həzrəti-Əliyə (ə) olan böyük məhəbbətlə açıqlayan “Bismillah” ayəsinin incə görüntüləri və “bə” hərfinin altında olan nöqtənin sirri”, oxucunu düşündürən, irfanla, islam fəlsəfəsi ilə, sufiliklə bağlı elmi biliklərin toplandığı “Ariflərin Haqqa qovuşma məqamı (Şəriət, təriqət, mərifət, həqiqət)”, İmam Hüseynin (ə) Şamda faciəli şəkildə şəhid olan qızı haqqında yazılmış “Həzrəti-Rüqəyyə (s.ə)” adlı kitabları haqqında bir çox ziyalılar dəyərli fikirlər söyləmişlər.

Əlimizdəki kitab uyğun olaraq dörd bölümdən ibarətdir. Hər bölümdə zilhiccə ayındakı bir bayram haqqında əhatəli məlumat verən müəllif müxtəlif şairlərin əsərlərindən örnəklər verməklə kitabın daha da maraqlı olmasına çalışmışdır.

Həzrəti-Əli (ə) ilə Fatimeyi-Zəhranın (s.ə) izdivac günü ilə bağlı məlumatları hədislər vasitəsilə diqqətə çatdıran müəllif bu bölümü Məhəmmədhüseyn Şəhriyarın bir məsnəvisi ilə daha da zənginləşdirmişdir.

Hacı Həsən Qurban bayramına bir qədər daha çox yer ayırmışdır. Sözünə Həmid Nitqinin nəzmində Quranın mədhi ilə başlayan müəllf daha sonra Xətai və Aşıq Qurbani şeirinə müraciət edir. Qurban bayramının tarixinə qısa ekskursiya edərək, yenə də aşıq şeir nümunələrindən örnəklər verir. “Qurban bayramının əməlləri”indən, “Qurbanlığın şərtləri”ndən əhatəli bəhs edərək, sonda müasir şairlərin şeirlərini təqdim edir.

Daha sonra “Qurban” bayramı ilə “Ğədir-Xum” bayramı arasındakı bağlılıq”ı izah edən Hacı Həsən “Kamillik bayramı Ğədir-Xum” adlı bölümə keçid alır. Bu bölüm kitabın həcmcə ən böyük hissəsidir. Əvvəldə Nəbati şeirinə müraciət edən müəllif, demək olar ki, Ğədir-Xum haqqındakı bəhsi Seyyid Əzimin bir müxəmməsinin şərhi ilə paralel verir. Bu bölümdə “Mövla sözünün təhlili”, xilafətlə, imamətlə bağlı fikirlər də maraq doğurur.

Mübahilə bayramı haqqındakı bölüm Qurani-Kərimdən Mübahilə ayəsinin şərhi ilə başlamışdır. Hədislərə müraciət edən Hacı Həsən fikirlərini əyaniləşdirmək üçün ədəbi nümunələrdən də istifadə etmişdir.

Tədqiqatçı qardaşımızı yeni kitabının işıq üzü görməsi münasibətilə təbrik edir, ona yeni uğurlar arzulayır və yeni kitablarını gösləyirik. Ümid edirik ki, Hacı Həsən Hüseyninin bu kitabı da əvvəlki kitabları kimi böyük oxucu auditoriyası qazanacaqdır.

***SONA XƏYAL***
*AMEA-nın Məhəmməd Füzuli adına*
*Əlyazmalar İnstitutunun böyük elmi işçisi,*
*Azərbaycan Yazıçılar Birliyinin*
*“İRS” Komissiyasının sədri*

## BƏŞƏRİN İKİNCİ ATASI HƏZRƏTİ NUH(ə)

İlk öncə onu qeyd edək ki, Həzrəti-Nuh(ə) Həzrəti-Adəmdən(ə) sonra bəşərin ikinci atası olmaqla bərabər ülul-əzm peyğəmbərərin birincisi və şəriət sahibi olmuşdur. Əvvəlcə bu əzəmətli peyğəmbərin adı, əxlaqı və onun xüsusiyyətləri barədə oxucuya qısa da olsa məlumat verməyi özümüzə borc bildik.

Nuhun əsl adı müxtəlif rəvayətlərdə gəlmişdir. Bəzilərində Əbdül-Qəffar, Əbdül-Məlik, bəzilərində isə Əbdül-Əla olduğu qeyd olunmuşdur. O, həddindən artıq ağladığına görə onu Nuh deyə çağırırdılar. Bu əzəmətli şəxs gözəl bəyana və güclü məntiqə malik idi. Nuh peyğəmbər indiki insan nəslinin ikinci atası sayılır. Yəqubi və onun kimi bir çox tarixyazarlar onun ömrünü Ənkəbut surəsində olduğu kimi camaatın arasında qalma müddəti (950 il) qeyd edirlər. Məclisi "Biharul-ənvar" kitabında yazır ki, yer əhli Nuhun ömründə ixtilaf edirlər. Bir qrupu 1000 il, biri 1450, üçüncüsü 1470 il, dördüncüsü 2300 il, amma mötəbər rəvayətlərdə 2500 il gəlmişdir.

Digər səmavi kitablarda olduğu kimi Tövrat və Quranda Nuhun yaşı ilə əlaqədar ifadələr Babil və Şumerlərin tufan əhvalatlarındakı (Qilqameş dastanı) Ziusudra və Utnapiştim obrazları ilə böyük bənzərliklər göstərir. Mesopotamiyada cəmiyyətə dərindən təsir edən bir sel fəlakəti üzərində yaradılan və cəmiyyət hafizəsinə həkk olunan dastanlarının İvritlərin babilistan sür-

günü qayıdışında yazılan Tövrat nüsxələrinə ötürüldüyü güman edilir.

## Həzrəti-Nuha(ə) Allah tərəfindən peyğəmbərlik müjdəsi verilməsi

Nuh peyğəmbərin ömründən 460 il keçmişdi. O hələ də dağlarda yaşayır və Allaha ibadət edirdi. Arvad-uşaq sahibi də deyildi, yundan paltar geyinir və öz yeməyini bitkilərdən hazırlayırdı. Bu yaşında Cəbrail onun yanına gəlib - Allahın salamını ona çatdırıb nübüvvət məqamını müjdə verdi.Onu Əmurə, Zəşran ibni Uxnunun qızı ilə evlənməyi əmr etdi. O, ilk şəxs idi ki, ona iman gətirmişdi». Nuh ilahi məmuriyyətə əməl etmək üçün camaatın içərisinə daxil oldu. Onun əlində insanların batinindən xəbər verən əsası var idi. Nuhun gəlişi camaatın bayram gününə təsadüf edirdi.

Nuh qövmünün sərkərdələri yetmiş nəfər idi. O gündə onlar öz bütlərinin ətrafına yığışmışdılar. Nuh onların arasına varid olaraq "La ilahə illəllah" səsini ucaltdı. Özünün, ondan qabaq və sonra gələn peyğəmbərlərin nübüvvətini onlara çatdırdı. Bu anda idi ki, bütlər titrəməyə başladılar, yanan alovlar söndülər və camaat dəhşətli qorxuya düşdülər. Başçılar və sərkərdələr "Bu kişi kimdir?" -deyə soruşdurlar. Nuh dedi: -«Mən Allahın bəndəsiyəm. Allah taala məni sizləri onun əzabından qorxutmaq üçün göndərib».

Əmurə Nuhun sözlərini eşitcək ona iman gətirdi. Atası bu mövzudan xəbərdar oldu və onu məlamət edərək dedi: -"Nuhun sözləri bu tezlikdə səndə təsir qoydu. Qorxuram padşah xəbərdar olsun və səni öldürsün." Amma Əmurə atasının sözlərinə məhəl qoymadı və öz imanından əl çəkmədi. Ondan sonra da onu nə qədər qorxutdular, həbsdə saxladılar yenə də Nuhun Allahına olan imandan əl çəkmədi. Nəticədə Nuhla evləndi və Sam ibni Nuh ondan dünyaya gəldi.

## Dinin təbliği

Nuh uzun ömr etməsinə, kafir və müşrik camaat arasında hamıdan çox qalmasına və dinin təbliği yolunda etdiyi ağır mübarizələrə dözməsinə baxmayaraq ona çox az, barmaq sayına gələn kəslər iman gətirdilər.

Dini təbliğ etməsi müqabilində camaat Nuha çoxlu əziyyətlər verirdilər. Onu söyür, dəli, azmış və cinvurmuş deyə çağırır və müxtəlif növdə cismi işkəncələr verirdilər. Nuhun öz qövmunə qarğışı Tabeçiləri düşmənlərin əzab-əziyyətindən təngə gəlmişdilər və Nuhdan istədilər ki, Allahdan bir qurtuluş yolu tələb etsin. Nuh onların xahişini qəbul etdi. Namaz qıldıqdan sonra əllərini Allah dərgahına qaldırıb dua etdi. Cəbrail nazil olub Nuha dedi: -"Allah-taala sənin duanı qəbul etdi. Get öz tərəfdarlarına de ki, xurma yeyib tumunu basdırsınlar. Hər vaxt xurma ağacı olub bəhər versə istəklərinə çatacaqlar.

Nuh Cəbrailin sözlərini möminlərə çatdırdı. Onlar hamısı sevincək Allahın fərmanına əməl etməyə başladılar. Ağaclar böyüyüb bəhər verdikdə Nuhun yanına gəlib dedilər: -"Xəbər verdiyin zaman gəlib yetişmişdir." Nuh Allahdan istədi ki, öz vədəsinə əməl edib əzabı nazil etsin. Vəhy gəldi ki, onlara de: -"Xurmalarını yeyib tumunu basdırsınlar. Ağaclar bəhər verəndə xilas olacaqlar." Bu sözdən sonra Nuha iman gətirənlərin üçdən bir hissəsi dindən əl çəkib mürtəd oldular. Amma qalan üçdən iki hissəsi isə xurma yeyib, tumunu əkdilər. Ağac böyüyüyənə qədər ona qulluq etdilər. Bəhər verdikdə Nuhun yanına gəlib Allahın vədəsinə vəfa etməsini istədilər. Yenə də vəhy oldu ki, onlara de: -Xurmasını yeyib tumunu əksinlər. Bu zaman digər üçdən bir hissə də dindən üz döndərdilər. Ancaq üçdən bir hissəsi qaldı. Allah tərəfindən yenə də əmr yetişdi. Tumu əkdilər, böyüdü və bəhər verdi. Nuhun yanına gəlib dedilər: -"Bu bir neçə nəfərdən başqa heç kəs qalmayıb. Əgər bu dəfə də təxirə düşsə biz də qorxuruq ki, dində həlak olanlardan və azmışlardan olaq." Nuh namaz qıldı, dua etdi və duasında belə dedi: -"Pərvərdigara, bu bir neçə nəfərdən başqa heç kəs qalmayıb, qorxuram əgər bu dəfə də təxirə salsan onlar da getsinlər. Bu anda Allahdan vəhy gəldi. "Duanı qəbul etdik, indi isə gəmi düzəltməyə başla."

Başqa bir hədisdə deyilir ki, imtahanlardan sonra 72 nəfərdən çox dindar qalmadı. Allah taala Nuha belə vəhy et-

di: -"Bu ona görə idi ki, xalis, pak, əsl mömin bəndələr qalsınlar və napak insanlar sənin ətrafından təmizlənsinlər. İndi mən onlara dinlərində qüvvət verəcəyəm və qorxularını əmin-amanlıqla dəyişdirəcəyəm ki, mənə ixlasla ibadət etsinlər.

Beləliklə Nuh öz qövmündən tamamilə ümüdini üzdü. Onların düşmənçiliyini, əzab-əziyyətlərini görüb onlara şiddətlə nifrin edərək dedi: -"Ey Rəbbim! Yer üzündə bir nəfər belə kafir qoyma. Çünki Sən onları (sağ) buraxsan, onlar Sənin bəndələrini yoldan çıxardacaq, ancaq pozğun və kafir (oğul-uşaq) doğub törədəcəkdir!" («Nuh»-28)

Allah taala Nuhun duasını qəbul etdi və əzabı o zalım camaata qəti etdi. Hətta Nuha belə onlar üçün kömək istəməməsini əmr edərək buyurdu: "Zülm edənlər barəsində Mənə müraciət etmə (onların bağışlanmalarını Məndən xahiş etmə). Çünki onlar suda boğulacaqlar!"

Ənəs ibni-Malik Peyğəmbərdən(s) nəql edir: “Elə ki, Allah Nuhun (ə) qövmünü həlak etmək qərarını verdi, ona vəhy nazil edərək palıd ağaclarının gövdələrini kəsməyi əmr etdi. Nuh (ə) gövdələri kəsəndən sonra nə edəcəyini bilmədi. Bu zaman Cəbrayıl (ə) nazil oldu, o, özü ilə birlikdə 129000 mismar olan bir sandıq gətirmişdi. O, Nuha (ə) gəmini necə düzəltməyi öyrətdi. Nuh (ə) bütün mismarları gəmini düzəldərkən bərkitmə işlərinə sərf etdi. Növbə yerdə qalan 5 mismara çatdıqda, qəribə hadisə baş verdi. O, mismarın birini götürüb işlətmək istəyərkən, mismar parlaq nur saçmağa başladı. Nuh (ə) bundan hey-

rətlənib Cəbrayıldan (ə) soruşdu: “Ya Cəbrayıl, bu necə mismardır? Mən beləsini görməmişdim.”

Cəbrayıl (ə) dedi: “Bu mismar Muhəmməd ibni-Abdullahın (s) adınadır. Onu gəminin sağ tərəfinə vur.”

Sonra Nuh (ə) ikinci mismarı götürdü. Bu mismar da nur saçmağa başladı. Nuh (ə) soruşdu: “Bəs, bu nə mismardır?” Cəbrayıl (ə) cavab verdi: “Bu Muhəmmədin (s) qardaşı və əmisi oğlu Əlinin (ə) adınadır. Onu gəminin sol tərəfinə vur.”

Üçüncü mismarı götürərkən də eyni hadisə baş verdi. Cəbrayıl (ə) dedi: “Bu Muhəmmədin qızı Fatimənin (ə) adınadır. Onu atasının mismarı vurulan tərəfə vur!”

Dördüncü mismar da nur saçdı. Cəbrayıl (ə) dedi: “Bu Əlinin və Fatimənin oğlu Həsənin(ə) adınadır. Bunu atasının mismarının tərəfinə vur!”

Nəhayət, Nuh (ə) beşinci mismarı əlinə götürdü. Bu mismar da parlayıb nur saçdı, amma Nuh (ə) onda rütubət hiss etdi. Cəbrayı l(ə) dedi: “Bu mismar Allah yolunda şəhid olanların ağası Hüseyn ibni-Əlinin (ə) adınadır.”

Qurani-Kərimdə buyurulur:

“Biz Nuhu (ona iman gətirənlərlə birlikdə) dirəklərdən düzəldilmiş və mismarlanmış gəmiyə mindirdik.” (“Qəmər”s, ayə.13)

Həzrət Peyğəmbər (s) buyurur: “Dirəklər burada həmin gəminin taxtaları, mismarları dedikdə isə biz nəzərdə tuturuq. Əgər biz olmasaydıq, gəmi hərəkət etməyəcəkdi.”

Qeyd: burada "mismar" kəlməsi Peyğəmbərin (s) hədisdə buyurduğu beş mismara işarədir. Nuh (ə) gəmiyə minərkən tufanda qərq olmamaq üçün Allaha belə dua etdi: "Ey Allahım, mənə Muhəmməd (s) və Ali-Muhəmmədin hörmətinə nicat ver." Allah da onun duasını qəbul etdi.("Biharul-Ənvar" s, c.26.səh.329)

Peyğəmbər (s) yəhudilərlə olan mübahisələrin birində belə buyurub: "Allah Nuhu Muhəmməd və Ali-Muhəmməd hörmətinə böyük bəlalardan xilas etdi."("Biharul-Ənvar" s, c.12.səh.40)

## Nuhun gəmisi

Allah-taala Nuha xəbər verdi ki, bu bir neçə nəfərdən başqa daha heç kəs sənə iman gətirməyəcək. Onun ardınca gəmi düzəltməyi ona əmr etdi. Nuh gəmini düzətməyə başladı. Hər tərəfdən taxta və mismar yığaraq onları birbirinə birləşdirdi. Sürətlə taxtalar gəmi şəklinə düşürdü. Zəif düşüncəli insanların Nuhun qarşısında düzgün məntiqləri olmadıqlarına görə hər bir şeylə ona əziyyət vermək istəyirdilər. "ey Nuh, peyğəmbərlikdən əl çəkib xərratlığa keçmisən?", "Bu quru susuz yerdə bu uzunluqda gəmini niyə düzəldirsən? Quru səhrada gəmi sürmək istəyirsən?", "Bu gəmini quru yerdə düzəldirsən, bəs harda suya atacaqsan?" kimi sözlərlə məsxərəyə qoyurdular. Nuh onların cavabında ancaq bir cümləni təkrar edirdi: -«Əgər (indi) siz bizi məsxərəyə qoyursunuz, (vaxt gələcək) biz də sizi

bizi məsxərəyə qoyduğunuz kimi məsxərəyə qoyacağıq. Onda rüsvayedici əzabın kimə gələcəyini və kimin əbədi əzaba düçar olacağını biləcəksiniz». Bir hədisdə gəlmişdir ki, o, ağac əkməyə başladı. Bəziləri onun yanından keçərək ona gülüb, məsxərəyə qoyaraq deyirdilər: -"Ağac əkməklə məşğul olursan?" Ağaclar böyüdü. Onları doğrayaraq yonmağa başladı. Yenə gəlib deyirdilər: -"İndi də xərratlığa keçmisən?" Nəhayət gəmi düzəlib qurtardı. Bəziləri demişlər ki, uzunluğu 1200 (1 dirsək təxminən 50 sm-ə bərabərdir) dirsək, eni 800 dirsək, hündürlüyü isə 80 dirsək olmuşdur. Bəziləri isə uzunlunu 700 dirsək, eni 500 dirsək, hündürlüyünü isə 80 dirsək yazmışlar. Üçüncü fərziyyədə isə uzunluğu 300 dirsək, eni 800 dirsək, hündürlüyü isə 30 dirsək deyilir. İbni Abbasdan nəql olunur ki, gəminin üç mərtəbəsi var idi. Birinci mərtəbədə böyük və vəhşi heyvanları, ikincisində dördayaqlıları (dəvə, inək, qoyun və s.), üçüncü mərtəbədə isə insanların özü və bütün lazım olan yeməli, içməli şeyləri yerləşdirmişdi. Beləliklə gəmi tamamilə hazır oldu və Allahın əmri gəldi: -"Nəhayət, (onları məhv etmək barəsində) əmrimiz gəldiyi və təndir qaynadığı zaman dedi: -"Hər heyvandan biri erkək, o biri dişi olmaqla bir cüt, həmçinin əleyhinə (ölümün) əvvəlcədən hökm verilmiş şəxslər istisna olmaqla, qalan ailə üzvlərini və iman gətirənləri gəmiyə mindir." "Zülm edənlər barədə mənə müraciət etmə (onların bağışlanmalarını məndən xahiş etmə). Çünki onlar suda boğulacaqlar."

## Tufanın başlanması

Tufanın nişanəsi təndirdə suyun qaynaması idi. Bu təndir bir mömimə qadının evində idi və ondan çörək bişirmək üçün istifadə olunurdu. Nuhun arvadı ya mömimə qadın çörək bişirməklə məşğul idi. Birdən təndirdə su qaynamağa başladı. Dərhal hadisəni Nuha xəbər verdilər. Nuh gəlib bir az torpaq götürüb onun üstünü qapadı. Sonra gəmiyə qayıdıb lazım olan adamları və heyvanları gəmiyə yığdı. Yenə də qayıdıb torpağı təndirin üstündən götürdü. Bu an su qaynadı. Göy, su tuluğunun ağzı açılantək yağmağa, Fərat çayları və başqa bulaqlar daşmağa başladı. Göy guruldayıb dəhşətli yağış yağdı. Bir azdan bütün yer üzü, çöllər, səhralar, meşələr su ilə doldu. Ancaq gəmidə olan Nuh, onun ailəsi və iman gətirənlər nicat tapdılar.

Nuhun Kənan adlı oğlu düşmənlərin zümrəsilə yaşayır, atasından uzaq gəzirdi. O, hələ də atasının dininə iman gətirməmişdi. Su bütün yer üzünü basanda Nuh və onunla birlikdə gəmidə olanlar o dəhşətli mənzərəyə tamaşa edirdilər. Birdən Nuhun gözü, başqa zalımlar kimi özünü boğulmaqdan xilas etməyə cəhd edən oğluna sataşdı. Nuhda atalıq məhəbbəti coşaraq onu çağırıb dedi: -"Oğlum, bizimlə birlikdə gəmiyə min, kafirlərdən olma!" O bədbəxt o qədər təkəbbürün əsiri idi ki, bu iztirablı halda atasının sözlərinə qulaq asmadan ona belə cavab verdi: -"Mən bir dağa sığınaram, o da məni sudan qoruyar." Amma bundan qafil idi ki, bu sel kiçik, adi sellər kimi deyil, bəlkə Alla-

hın tufan və sel şəklində düşən qəzəbidir və bu tufan qudurmuş, zalım insanları udur. Ondan qurtarmaq üçün heç bir çıxış yolu yoxdur. Nuh da bu məsələni ona başa saldı və ürəyi yanaraq dedi: -"Allahın iradə etdiklərindən başqa, bu gün heç kəs (insanları) Onun əzabından qoruya bilməz. Nəhayət, (onun sözləri qurtarıb-qurtarmamış) dalğa ata ilə oğlunun arasına girib onları bir-birindən ayırdı və o da suda boğulanlardan oldu."

## Xilas olanların sayı

Nuhun tufanından xilas olanların sayı haqqında dəqiq məlumat yoxdur. Ona iman gətirənlərin sayını 72 nəfər olduğu qeyd olunur. Müfəssirlərin bəziləri 80 nəfərin olduğunu yazırlar. Başqa bir hissəsi isə 78 nəfərin, - 72 nəfəri öz qövmünün kişi və qadınları, 6 nəfər isə öz ailəsi, oğulları və qadınları olduğunu qeyd edirlər. İmam Sadiqdən (ə) nəql olunan bir hədisdə onların cəmi 10 nəfər olduqları qeyd olunur. Başqa bir fərziyyədə isə 7 nəfər deyilir.

Hər halda çox az adam nicat tapdı. Onlardan Nuhun üç oğlu, Sam, Ham, Yafes və arvadları ki, indiki yer üzündə olan irqlər onlardandırlar.

## Tufan bütün Yer üzünü tutdu

Quran ayələrində və sair göstəricilərdən belə başa düşülür ki, Nuhun tufanı ümümi olub və bütün yer üzünü tut-

muşdur. Necə ki, onun çağırışı ümumi olub və yer kürəsinə göndərilən ən böyük peyğəmbərlərdən biridir. İslam terminologiyasında onlara "Ulul-əzm" peyğəmbərlər deyilir. Qədim Yunan, İran və Hindistan dini-tarixi kitablarında tufanın bütün yer üzünü tutması haqqında dastanlar yazılmışdır.

Həmçinin İbni Əsir və başqalrı da tarixi nəzərdən tufanın ümumi olduğunu bilib və məcusilərin bunun əleyhinə olan sözlərini tarixlə inkar edir, yuxarıdakı ayədəki sözlərinə sübut gətirirlər. Məsudi də öz tarix kitabı "Murucuzzəhəb"də qeyd edir ki, tufan bütün yer üzünü basmışdır.

Ancaq bir ehtimala yer qalır ki, bəziləri ayələrin də bu mənaya olmasını yazırlar. O ehtimal budur ki, mümkündür o zaman yer üzündə təkcə Nuhun qövmü olmuşdur və tənha Nuhun tayfası yaşayan yerləri su basmışdır. Yəni yer üzündə onlardan başqa insanlar, başqa canlı məxluq olmamışdır. Buna görə də tufan o zaman yaşayan bütün insanları və heyvanları məhv etmişdi. Nicat tapanlar ancaq gəmidə olanlar idi. İnsan nəsli Nuhun övladlarından və heyvanların nəsli isə gəmidə olan heyvanlardandırlar.

## NİCAT BAYRAMI

Nuhun və onun qövmünün salehlərinin nə qədər gəmidə həyat sürmələri barəsində müxtəlif nəzəriyyələr mövcuddur. Bəziləri deyirlər ki, yeddi gün keçdikdən sonra su çəkildi və gəmi Cudi dağında (İraqda Musil şəhərində) ye-

rə oturdu. Bəziləri bu müddəti bir ay qeyd edirlər. Bir hədisdə altı ay gəlmişdir. Yəqubi öz tarixində Nuhun gəmiyə minməsindən düşənə qədər bir il on gün keçməsini yazmışdır. Quranda bu müddətin gəlməməsinə baxmayaraq suyun çəkilməsi və gəminin Cudi dağında oturması kiçik bir ayədə bəyan olunmuşdur. Bu kiçik ayə o qədər fəsahət-bəlağəti baxımından yüksəkdir ki, o zamanın ərəb ədəbiyyatçıları və İslam düşmənlərini heyrətə gətirmişdi. Onlar bu ayə kimisini gətirməkdə öz acizliklərini etiraf etdilər.

Nəhayət Nuh və onun qövmü gəmidən yerə endilər və Yer kürəsində yeni həyat üçün fəaliyyətə başladılar. Yavaş-yavaş əkin sahələri yaratdılar və evlər tikdilər.

Əzəmətli tufandan sonra Nuhun ömrü haqqında fikir ayrılığı vardır. Bəzisi 60 il, Yəqubi öz tarixində 360 il, Təbəri isə 348 il yazır. İmamlardan gələn bir neçə hədisdə isə 500 il qeyd olunur.

Tarix və rəvayətlərə əsasən Həzrəti-Nuhun (ə) qəbrinin İraq Ərəb Respublikasının Nəcəf şəhərində –Həzrəti- -Əlinin (ə) məzarının yanında yerləşdiyi nəql olunur.

## MARAQLI HADİSƏ, YAXUD TƏSADÜF

1385-ci ildə (hicri-qəməri) Kərbəladakı İslami xeyriyyə cəmiyyəti Nəcəfdə nəşr olunan “Əl-vəzirə” jurnalının II, III tirajlarında Pakistanın Bilahur şəhərində “İslami mərifətlər” nəşriyyatının dərc etdirdiyi “Təsadüf?!” adlı bir məqalə yayımladı.

1951-ci ildə “Qaf vadisi” adlı məntəqədə Sovet arxeoloqları tərəfindən qazıntı işləri aparılarkən üzərində yazı olan qədim taxta qırıntıları aşkarlanmışdı. Bu da onları həmin qazıntı işlərini genişləndirməyə, həm də dərinləşdirməyə vadar etmiş və nəticədə bir çox daşa dönmüş taxtalar üzə çıxmışdı.

Axtarış nəticəsində tapılmış bu taxtalar arasında uzunluğu 14 m, eni isə 10 m olan dairəvi bir lövhə onları təəccüb və dəhşətə gətirmişdi. Belə ki, bu taxta digərlərindən fərqli olaraq heç bir tarixi təsirə məruz qalmamışdı.

1952-ci ilin sonunda bu taxtalar ətrafında aparılan tədqiqatın nəticəsində məlum olmuşdur ki, tapıntılar Nuhun (ə) gəmisinə məxsusdur. Qədim dildə olan yazının nədən bəhs etdiyini müəyyənləşdirmək üçün 1953-cü ildə Sovet hökuməti 7 mütəxəssisdən ibarət xüsusi komissiya təşkil edir. Bu alimlərin siyahısını diqqətinizə təqdim edirik:

1. Sulyanov – Moskva universitetində dil üzrə müəllim.
2. Xruyev – həmin universitetdə dil üzrə müəllim.
3. Müşatin – “Qədim əsərlər” muzeyinin direktoru.
4. Korovin – “Koynazoy” fakultəsində müəllim.
5. Polkin – “Lenin” institutunda arxeologiya müəllimi.
6. Əhməd Poladi – Elmi araşdırma və tədqiqat üzrə rəhbər.
7. Kolotov – “Stalin” universitetinin direktoru.

Bu komissiyanın 8 aylıq araşdırmalarından sonra gəldiyi nəticə bu olmuşdur ki, lövhə Nuhun (ə) gəmisinə məxsusdur və bəlalardan qorunmaq üçün qoyulmuşdur. Löv-

hənin üzərində olan yazı qədim Samiyyə dilində yazılmışdır. Britaniyalı alim, Mançester universitetinin qədim dillər üzrə müəllimi N.F.Maks yazını ingilis dilinə tərcümə etmişdir:

Nəzərinizə çatdırmaq istəyirəm ki, "İlya", "Şəbbər" və "Şübeyr" Samaniyyə dilində "Əli", "Həsən" və "Hüseyn" adlarının qarşılığıdır. Alimlər bu beş müqəddəs adın və onların Allah yanında olan məqamının ucalığı qarşısında dəhşətə gəlmişlər, çünki Nuh (ə) onlarla Allaha təvəssül etmişdir. Ən maraqlısı budur ki, 1000 illərdən sonra alimlər (özü də qeyri-müsəlman, ateist) bu lövhədəki yazını oxuyub açıqlaya bilmişlər.

Lövhə hal-hazırda Moskvada "Qədim əsərlər" muzeyində saxlanılır. Biz onu müşahidə edən qardaşlarımızın bəzisi ilə görüşmüşük. Sizin də yolunuz həmin tərəflərə düşsə, öz gözlərinizlə həmin lövhəni görə bilərsiniz və bu, sizin Əhli-beytin(ə) məqamı barəsindəki etiqad və yəqininizin artmasına, inşallah, bir vasitə olar.

Allah Qurani-Kərimin "Qəmər" surəsinin 15-ci ayəsində buyurur:

"Biz onu (Tufan hadisəsini, yaxud Nuh qövmünün başına gələnləri) ibrət və nişanə üçün saxladıq. Heç ibrət alan varmı?"

Ayədən belə nəticə ala bilərik ki, Allah-Təala Nuhun (ə) gəmisini daimi nişanə və parlaq əlamət olaraq saxladı ki, zaman boyunca gələn nəsillər bu nişanədən dərs alaraq, Allahın qəzəbindən çəkinib rəhmətinə meyl etsinlər.

Sual oluna bilər ki, hal-hazırda Nuhun (ə) gəmisi haradadır və ondan əsər-əlamət qalıbmı?

Cavab: Heç şübhəsiz ki, Nuhun(ə) gəmisindən beş müqəddəs şəxsin adı yazılmış o lövhədən başqa heç nə qalmamışdır.Bu tarixi hadisədən uzun zaman keçməsinə baxmayaraq, lövhə, nəinki çürümüş, əksinə, salamat qalaraq zamana meydan oxumaqdadır.

Buradan da belə məlum olur ki, ayədə nəzərdə tutulan "ibrət" və "nişanə" məhz həmin 5 müqəddəsin adı yazılmış lövhədir. Allah bu lövhəni dəlil və nişanə olaraq saxladı ki, insan hidayət tapıb Əhli-beytin (ə) məqamını dərk etsin. Doğrudan da, bu lövhə bizi onları sevməyə təhrik edir, lakin Allah həmin ayənin davamında necə də doğru və gözəl buyurur: "Heç ibrət alan varmı?" və "Allahın dininə (İslama) dəstə-dəstə daxil oldular." Bu əbədiyaşar möcüzənin təsirindən çoxlu insan ibrət alaraq İslama qədəm qoyub Əhli-beyt (ə) bayrağının altına sığındı, bu lövhəni qəti dəlil bilərək, İslamın haqq dini olduğunu və Əhli-beytin (ə) uca məqamını təsdiq etdilər.

Əhli-beytin (ə) Allahın ən fəzilətli məxluqu, ilahi hikmətin yer üzündəki daşıyıcıları və ən sevimli bəndələri olmasının bərəkətidir ki, bu lövhə zamanın təsirlərinə məruz qalmamış, tarixin işıq çatmayan qaranlıq dünənindən bu günün insanına haqqın istiqamətini, nicat yolunun harada olduğunu açıq-aydın göstərir. Belə ki, Nuh (ə) bu adların əzəmətini bildiyinə görə, ehtimal olunan xətər və bəlalardan qorunmaq üçün lövhənin üzərinə yazaraq gəmiyə qoy-

muşdur. Gəmi dağ hündürlüyündə olan dalğalar arasında qorxu ilə, çətinliklərlə əhatə olunmuş halda hərəkət edirdi. Lakin Allah o beş şəxsin xatirinə bu gəmini içindəkilərlə birlikdə qorudu və salamat saxladı. Həzrət Peyğəmbər (s) bu hadisəyə işarə edərək buyurur: "Əgər biz olmasaydıq, gəmi hərəkət etməzdi."

Nuhun (ə) barəsindəki bu ibrət əsəri bizim üçün, həmçinin, bir örnək ola bilər ki, biz də evlərimizi, məhəllələrimizi, nəqliyyat vasitələrimizi bu adlar yazılmış lövhələrlə şərəfləndirək və Allah onların hörmətinə bizi də bəla və xətalardan hifz edib amanda saxlasın.

Allah bizi müvəffəq etsin.

Lövhənin üzərindəki yazıların tərtibi forması(yazı sağ tərəfdən oxunar)

Lövhənin aşağıdakı hissəsindəki hərflər

Lövhənin yuxarı hissəsindəki hərflər

Lövhənin orta hissəsindəki hərflər.

Lövhənin yan tərəfində olan hərflər.

1. "Tafanenzov" jurnalı, Moskva, 1953-cü il, noyabr ayı.

2. "Weekly-mirror" jurnalı, 1953-cü il, dekabr ayı

3. "Əlhuda" jurnalı, Qahirə, 1954-cü il, mart ayı.

You can rofort bidht.

Bu hərfləri ingilis dilinə Britaniyada fəaliyyət göstərən N.F.Maks adlı dilçi alim tərcümə etmişdir:

"O my God! My helper. Reap my hand vith mercy and with your Holy bodies.

Mohammad. Alia. Shabbar. Shabir. Fatima!

They all are biggest and honorable!

The world Established for them.

Help me by their names.”

“Ey Allahım, lütfünlə, rəhminlə və bu müqəddəs məxluqların hörmətinə – Muhəmməd, İlya, Şibir, Şubeyr, Fatimə – mənə kömək ol. Həqiqətən bu beş nəfər əzəmət sahibləridir və onlara ehtiram etmək vacibdir. Çünki sən bütün dünyanı onların xatirinə xəlq etmisən.”

1. “Stafor Bartania” jurnalı, 1954-cü il, yanvar.

2. “ Maneheslor Sunlight” jurnalı, 1954-ci il, 23 yanvar.

3. “London Weekly Mirror” jurnalı, 1954-ci il, fevral.

Digər maraqlı bir əhvalat.

İraqın Hillə şəhəri yaxınlığında qəribə bir əhvalat müşahidə olunmuşdur. Bir ağacı kəsib mişar ilə doğrayırkən, onun hər tikəsində “La ilahə illəllah, Muhəmmədur-rəsulillah, Əliyyun Vəliyyulah” sözlərinin yazıldığını görmüşlər.

# HƏZRƏTİ-MUSA(ə) HAQQINDA QISA MƏLUMAT

Bildiyimiz kimi Həzrəti Musa(ə) «ulul-əzm» I dərəcəli peyğəmbərdərdən biri olmuş , həmçinin səmavi kitablardan olan Tövratın və 9 ilahi möcüzənin sahibi olmuşdur. Şanlı kitabımız olan Qurani-Kərimdə Həzrəti-Musanın(ə) barəsində 31 surədə Allah-təala söhbət açmış, 136 dəfə adını zikr etmiş və ona «kəlmullah» deyə müraciət etişdir.

Qurani-Kərimin bir çox ayələrindən məlum olur ki, Firon İsrail oğullarının gücünün, qüdrətinin və ehtimal olunan üsyanın qarşısını almaq üçün onları ciddi təzyiq altında saxlayırdı. Bir qrup tarixçi və təfsirçinin yazdığına görə Firon bəni-İsraildə dünyaya gələcəyi və Firon hakimiyyətinə son qoyacağı öncədən xəbər verilmiş uşağın dünyaya gəlməsinin qarşısını almaq üçün oğlan uşaqlarının qətlə yetirilməsinə, qız uşaqlarının isə kənizlik etmələri üçün diri saxlanmasını əmr etmişdi. Musa(ə) məhz, belə bir şəraitdə dünyaya gəlmişdi. Anası övladına görə çox qorxurdu. Bu vaxt Musanı böyük inqilab üçün seçmiş Allah anasının qəlbinə belə bir ilham göndərir: «Bundan sonra onu bizə həvalə et, bax gör onu necə qoruyacaq və sənə geri qaytaracağıq». «Taha» surəsinin 38-42-ci ayələrində Allah təala Musaya belə buyurur: «Anana lazım olanı vəhy etdiyimiz zaman belə vəhy etdik: «Onu bir sandığa qoyub çaya burax ki, çay onu sahilə atsın və həm mənim, həm də onun düşməni onu götürsün». Gözlərim önündə boya-başa çatdırılasan deyə, Öz tərəfimdən (qullarım arasında) sənə mə-

həbbət oyatdım. Bacın gedib: «Sizə onun qayğısına qalacaq birisini göstərimmi?!» dediyi zaman ananın gözü aydın olsun və qəm yeməsin deyə səni ona qaytardıq. Sən bir nəfəri öldürdün. Biz səni qəm qüssədən qurtardıq. Biz səni sınaqlardan keçirdik. Sən illərlə Mədyən əhli üçün qaldın. Sonra da müəyyən olunmuş vaxtda buraya çatdın, ey Musa!». «Mən səni Özüm üçün hazır etdim!», «Sən və qardaşın ayələrimlə gedin və Məni xatırlamaqda səhlənkarlıq etməyin».

Hədislərin birində İmam Baqir(ə) belə buyurmuşdur: Musa dünyaya gəldikdə və anası körpənin oğlan olduğunu gördükdə üzünün rəngi dəyişir. Mamaça: «rəngin nə üçün dəyişdi?» deyə soruşduqda deyir: «Oğlumun başının kəsiləcəyindən qorxuram». Mamaça deyir: «Əsla qorxma! » Musa elə görkəmə malik idi ki, görənləri özünə məftun edirdi. Onu Firon sarayında qoruyan da məhz bu məhəbbət olmuşdur. (Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017.səh 314)

Allah təala 41-ci ayədə Musanın barəsində səni sanki özüm üçün istəyirmiş kimi hər cəhətdən islah etdim. Bu, Allahın Musa(ə) haqqında buyurduğu ən sevgi dolu sözdür. Filosofların təbirincə desək, «Allah hər hansı bir bəndəni sevdiyində onu dostun dosta bəslədiyi kimi rəğbət bəsləyir».

Musa(ə) o qədər ədəbli idi ki, hətta dua edərkən də açıq şəkildə «Ey Rəbbim, filan cür et!» demədi. Sadəcə belə

dedi: «Ey Rəbbim! Sənin mənə göndərəcəyin istənilən xeyrə ehtiyacım var!» («Qəsəs» - 24). Bu duası ilə Musa(ə) yalnız ehtiyac duydyğyny dilə gətirir, qalanını Allahın Öz mərhəmətinə həvalə edirdi. Möminlərin əmiri Həzrəti-Əli(ə) peyğəmbərlərin zahidliyi və dünyaya etinasızlıqlarından danışarkən belə buyurmuşdur: «Əgər ondan (İslam peyğəmbərindən(s) başqa kimisə özünə öndər seçmək istəsən Musanı(ə) seç. Çünki, o, buyurmuşdu: Ey Rəbbim! Sənin mənə göndərəcəyin istənilən xeyrə ehtiyacım var!» And olsun Allaha, istədiyi yalnız bir tikə çörək olmuşdur». («Nəhcül -bəlağə»- 159cu xütbə. Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017, səh.388).

## HƏZRƏTİ- MUSANIN(Ə) TUR DAĞINA GETMƏSİ

Həzrəti- Musanın (ə) istəklərinin əsas qayəsini Allahı çox-çox yad etmək, ona tərif demək təşkil edir. Allaha tərif demək, Allahın şirk və nöqsanlardan uzaq olduğunu ifadə etməkdən ibarətdir. Həzrəti Musanın məqsədi «sübhanəllah» (Allah eyb və nöqsanlardan uzaqdır) cümləsini təkrar-təkrar deməkdən ibarət deyi, onun çirkə bulaşmış inancları beyinlərdən yuması, şirk əlamətərini cəmiyyətdən təmizləməsi, insanların etiqad və əməllərində Allahın xatırlanmasını diriltməsi olmuşdur. «Taha» surəsinin 25-dən 34-cü ayələrinə qədər Musanın Allahdan dilədiklrinin şahidi oluruq. Musanən(ə) bu ayələrdə Allahdan dilədiyi istəklər, yəni güclü iradə, söz demək qüdrəti, ilahi yardım-

lar, etibarlı bir dosta malik olmaq, azğın cəmiyyəti dəyişmək, mənəvi və humanist dəyərlərə malik bir cəmiyyət yaratmaq üçün açıq şəkildə ehtiyac duyulan faktorlardır. Bu, onu göstərir ki, hətta, peyğəmbər təyin olunmazdan əvvəl belə, Musa(ə) çox ayıq bir alam olmuş, üzərinə düşən məsuliyyətin  bütün yönlərindən xəbərdar olmuşdur. Sünni və şiə mənbələrində mövcud olan hədislərdə islam peyğəmbərinin(s) də öz məqsədlərini həyata keçirmək üçün Allahdan eyni istəkləri dilədiyi qeyd edilmişdir. Sadəcə , peyğəmbər(s) Musanın qardaşı Harunun(ə) yerinə öz canişini və vəsisi olan Həzrəti-Əlinin adını çəkmişdir. (Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017.(səh.313)

Allah təala Qurani-Kərimin «Əraf» surəsinin 142-ci ayəsində b uyurur: Biz Musa ilə otuz gecə barədə vədələşdik, sonra ona 10 gecə də əlavə etdik. Beləliklə, Rəbbinin təyin etdiyi müddət tam 40 gecə oldu. Musa qaraşı Haruna dedi: «Sən tayfan içində mənim canişinim ol, (onları) islah etməyə çalış və (yer üzündə) iftnə-fəsad törədənlərin yolu ilə getmə!» ayədən də göründüyü kimi təyin edilmiş 40 gün müddəti bir dəfəyə deyil, mərhələli şəkildə təyin edilib, yəni əvvəl 30 gecə təyin edilib, sonra 10 gecə də ona əlavə edilib. Əslində təyin edilmiş müddət 40 gecə olmuşdur, lakin Allah təala İsrail oğullarını sınamaq üçün Musanı(ə) öncə 30 gecəlik bir görüşə dəvət edir, sonra münafiqlərin möminlərdən seçilməsi üçün həmin müddəti uzadır.

İmam Baqir(ə) buyurmuşdur: «Musa Allahın vəd verdiyi yerə gedərkən öz qövmünə bildirir ki, onun bu gedişi 30 gündən çox çəkməyəcək. Ancaq Allah təala həmin müddətə 10 gün də əlavə etdiyində İsrail oğulları: «Musa öz verdiyi sözdən çıxdı»-deyib buzova pərəstiş etməyə başladı». Hədislərdə bu 40 günün Zilqədə ayının birində başlayıb Zilhiccə ayının 10-u (Qurban bayramı günü) başa çatdığı qeyd edilmişdir. Ayədə 40 gün deyil, «40 gecə» ifadəsi işlədilmişdir. Bu da ona görədir ki, Musanın(ə) Allaha olan münacatları, danışıqları daha çox gecə vaxtları olurdu.

Sünni və şiə təfsirçilərinin çoxu bu ayəni təfsir edərkən «mənzilət» (mövqe, məqam, dərəcə) hədisinə işarə etmiş və peyğəmbər(s) səhabələrinin çoxunun Təbuk döyüşü ilə bağlı belə dediklərini qeyd Etmişlər: «Peyğəmbər(s) Təbuka doğru yollanarkən Həzrəti Əlini(ə) öz yerini təyin etdi. Əli(ə) dedi: «Məni uşaqların və qadınların arasında qoyursan(və icazə vermirsən ki, səninlə cihad meydanına gedim)?». Peyğəmbər(s) buyurdu: «Sənin mənə olan mövqeyinin Harunun Musaya olan mövqeyi kimi olmasını istəmirsənmi? Bir fərqlə ki, məndən sonra peyğəmbər olmayacaq». (Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017(səh.167).

Təfsirçi və tarixçilərin yazdığına görə əsasən məsələ belə olmuşdur. Musa(ə) hələ Misirdə olduqları zaman Allahın vəhyi əsasında Bəni-İsrailə Firona qalib gəldiyi zaman onlar üçün halal, haram, şəriət hökmləri olan bir ki-

tab gətirəcəyinin vədəsini vermişdi. Allah Fironu məhv etdikdən sonra onlar Musadan kitabı istədilər. Musa da Allahdan verdiyi vədəyə əməl edərək kitabı göndərməsini istədi.

Allah təala Musaya otuz gün ərzində oruc tutub bədən və paltarını pak edərək kitabı qəbul etmək üçün Turi-Sinaya getməsini əmr etdi. Musa özü olmadığı müddətdə qardaşı Harunu yerinə qoyaraq Bəni-İsrailin başçılığını ona tapşırdı. Daha sonra qövmündən 70 nəfər nüfuzlu şəxs seçərək özüylə Tur dağına apardı və Allah təaladan kitab alıb danışdığı zaman şahid olmalarını istədi. Beləliklə, o, stəyirdi ki, qayıtdıqdan sonra hadisəni Bəni-İsrailə danışıb nəticədə onu yalançı adlandırmasınlar. [1]

Musa (ə) Allahın əmrinə görə 30 gün oruc tutdu. Tövratın lövhələrini almaq üçün Tur dağına getdikdə Allah

---

[1] Bir dəstə yetmiş nəfərin seçilməsi dastının Musanın sonrakı məkana səfərinə aid olduğunu qeyd edib demişər: "Bu səfərdə Musa tək Tur dağına etmişdir. Bəni-İsrail buzova ibadət etməyə başladıqdan sonra Allah təala Musaya əmr edərək onlardan bir dəstəsini götürərək tur dağına gedib üzr istəmələrini əmr etdi..." bəziləri isə demişlər: "Harun dünyadan getdikdən sonra Bəni-İsrail Musanı onun qətlində günahkar bilmşdlər.Musa vəziyyəti açıqlayıb töhməti aradan götürmək üçün yetmiş nəfəri, o cümlədən Harunun uşaqlarını götürüb Harunun qəbri üstə əedib onunla danışdılar..." Bunlardan əlavə daha başqa nəzəriyyələr də vardır. Amma birinci fikir daha düzgün nəzəzrə çarpdığına, həmçinin Şiənin bəzi rəvayətləri və Quranin "Nisa" surəsinin 153-ğü ayəsi oln şahidlər onu təsiqlədiyinə görə biz onları burada yazmırıq,

təala daha on gün artırdı və Musanın şəhərdə olmaması qırx gün çəkdi[1].

Sünni təfsirçiləri belə yazmışlar: «On günün sonradan artırılmasına səbəb otuz gün oruc tutduqdan sonra sonuncu gecə Tur dağına getmək istədiyi zaman oruc tutma nəticəsində ağzındanxoşagəlməz iy gəldiyini hiss etdi. İyi aradan aparmaq üçün ağac çubuğu ilə (bgzilərinin dediyinə görə «xərnub» ağacıyla) dişlərini təmizlədi. Ya da bir başqalarının dediyinə görə xoş ətirli bitki yedi. Allah ona vəhy etdi:

- «Ey Musa, nə üçün iftar etdin?». Həzrəti Musa(ə) dedi:

- «Pərvərdigara, səninlə danışmaq istdiyim zaman ağzımdan xoş ətir gəlməsini istədi».

Allah təala buyurdu:

«Ey Musa, bilmirsən ki, oruc tutanın ağzının iyi mənim üçün müşkün iyindən də ətirlidir? İndi qayıt, daha on gün oruc tut sonra bizim yanımıza gəl!». Mussa belə də etdi.

Artırılmış on gün Bəni-İsrailin imtahan olmasına səbəb oldu. (əvvələr də buna işarə etmişdik). Samiri onlar üçün buzov düzəldib onları ibadət etməyə vadar etdi.

(Seyid Haşim Rəsuli Məhallati «Peyğəmbərlərin həyatı». Bakı 2010.Səh.302-303) + .

Qurani-Kərim. Ərəbdilindən tərcümə edənlər:

1. Z.M.Bünyadov; V.N.Məmmədəliyev. Bakı-2005.

---

[1] "Qisəsül - Ənbiya", Nəccar, səh.212

2. Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017.

3. «Xəstə Qasım-46 şeir».Bakı «Gənclik»-1975.

4. Aşıq Ələsgər «Gözüm bir alagöz xanıma düşdü» Bakı-«Yazıçı»1993.

5. İ.Nəsimi «Seçilmiş əsərləri» Bakı.Azərbaycan Dövlət Nəşr.1973

6. M.Füzuli «Leyli və Məcnun». N.Rzanın bədii nəsrlə şərhi.Bakı «Azərnəşr»1999.

7. H.Araslı «Böyük Azərbaycan şairi Füzuli» Bakı.1958.

8. Vərağa Almasov «İmam Hüseyn aşiqi Füzuli» Bakı-2016

## HƏZRƏTİ-İSANIN (ə) MÖVLUDU

Bu gün həzrət İsa (ə) peyğəmbərin anadan olan günüdür.

İsa (ə) peyğəmbər İslamda 5 ulul-əzm peyğəmbərdən biridir. Xristianlıqda isə Məsih, Nazaretli, İnsan Oğlu, Xilaskar və s kimi adlandırılıb..

İsa ibritcə Yeşua adlanır.

Quranda İsanın (ə) dünyaya gəlişi haqqında ətraflı xəbər verilsə də, doğum tarixi haqqında dəqiq məlumatlar verilməyib.

İsanın (ə) dünyaya gəlişi barəsində daha ətraflı Məryəm 16-36, Ali İmran 35- 63-ə baxa bilərsiz.

Bəzi tarixçilər İsanın (ə) döğum tarixin Oktyabr, bəziləri isə iyul ayında olduğunu qeyd etmişlər. Əgər belədirsə, onda niyə görə Milad bayramını dekabrın 25-də və Yanvar ayında keçirirlər?

Bu sualın cavabın "JW.ORG Yehovanın Şahidləri"nə istinadən qeyd edirəm:

"İsa Məsihin dekabrın 25-də doğulmasına heç bir sübut yoxdursa, onda nəyə görə Milad bayramını bu tarixdə qeyd edirlər?

«Britaniya ensiklopediyası»nda deyilir ki, kilsə rəhbərləri, çox ehtimal ki, bu tarixi qış gün dönümündə qeyd edilən və «bütpərəst Roma bayramı sayılan “məğlubedil-

məz günəşin doğum gününə” uyğunlaşdırmaq» üçün seçmişdilər.

«Amerikana ensiklopediyası»nda deyilir ki, bir çox alimlərin fikrincə, bu, xristianlığı qəbul edən bütpərəstlər üçün həmin dini daha doğma etmək məqsədilə edilmişdi»".

İsa (ə) zamanına görə möcüzəli bir həyat keçmişdir. Bu barədə quranın Nisa 156-159, Ali İmran 45-55, Zuxruf 57-61, , Maidə 110 və sair ayələrində xəbər verilir.

Qiyamətin 10 ən böyük əlamətindən biri də, İsanın (ə) Qiyamətdən əvvəl dünyaya qayıdışı və Dəccalı öldürməsidir.

Quran buyurur:

"Həqiqətən, (İsanın yer üzünə enməsi) Saatın (yaxınlaşmasının) əlamətidir. (Qiyamətə) şəkk etməyin və Mənə tabe olun. Budur, düz yol!". (Zuxruf, 61).

Abdullah ibn Abbas bu ayənin təfsiri barəsində belə rəvayət edir:

"Burada Qiyamətdən öncə İsanın enməsi nəzərdə tutulur". (İmam Əhməd: "Musnəd" 1.318).

Yəhudilərin həzrət İsanı (ə) öldürdüklərini iddia etmələri, Romalıların həzrət İsanı (ə) çarmıxa çəkərək öldürdükləri iddiasını bilməyən yoxdur. Amma quran bunu təkzib edir:

Və: “Həqiqətən, biz Allahın elçisi Məryəm oğlu İsa Məsihi öldürdük" demələrinə görə (lənət və əzaba düçar olublar)! Halbu ki, onu öldürmədilər və çarmıxa çəkmədi-

lər, amma iş onlara belə göründü (güman etdilər ki, İsa (ə) döyüşdə öldürüldü, yaxud onun şəkilində olan başqa bir şəxsin öldürülməsinə güman etdilər, yaxud da yalandan peyğəmbərlik iddiasında olan İsa adlı birisin bir müddətdən sonra öldürüldü). Həqiqətən onun barəsində fikr ayrılığında olanlar bu barədə şəkk və tərəddüd içindədirlər və o haqda zənn və gümana tabe olmaqdan başqa bir elmləri yoxdur. Onu həqiqətən öldürməyiblər. (Nisa 157)

İsa peyğəmbər (ə) sair peyğəmbərlər kimi möcüzə sahibi olub. Tarixdə isə ən çox ölü dirildən və xəstəyə şəfa verən kimi tanınıb.

Bir gün həvarilərin biri Həzrət Məsihi öz evinə dəvət etdi. Həzrət onun dəvətini qəbul edib, onlara getdi. Yolda Məsih hərəkət edən və camaatın məsxərə etdiyi bir cavanı gördü. O cavan kar idi. Heç bir şey eşitmədiyindən bir söz də deyə bilmirdi. Heyrətlə insanlara baxırdı. Onlarsa ona gülürdülər.

Məsih əllərinin içini məhəbbətlə onun başına və qulaqlarına çəkdi.Möcüzə baş verdi. O cavan ilk dəfə olaraq eşitməyə başladı.Camaatın istehza dolu sözləri bu macəraya təəccüb edən ifadələrlə əvəz olundu. Bəziləri Məsihə iman gətirib, O, həzrətin adamlarına qoşuldular.

Məsih dostunun evinə gedən yolunu davam etdirdi.

İsanın (ə) Allahın Oğlu olması dinimizə və əqidəmizə görə qəti şəkildə rədd edilir. Sadəcə olaraq İsa (ə) Allaha çox yaxın bir peyğəmbərlərdən və 5 ülül-əzm peyğəmbərlərdən biridir.

## İNSANLAR ÜÇÜN MƏNƏVİ VƏ ƏZƏMƏTLİ SÜFRƏNİN ENDİRİLDİYİ HESAB EDİLƏN BAYRAM GÜNÜ

Qurani Kərmidə adı çəkilən 25 və ya 28 peyğəmbərdən biri də Məryəm oğlu İsadır(ə). Həzrəti – İsa(ə) «ulil-əzim» birinci dərəcəli peyğəmbərlərdən olub və özünün şəriəti olub. Belə ki, səmadan enən 4 səmavi kitabdan birinin sahibi olub. Bu barədə «Məryəm» surəsinin 30-cu ayəsində oxuyuruq: (qəfildən İsa dil açıb dedi): «Mən Allahın quluyam! O, mənə kitab verib və məni peyğəmbər etmişdir». Həzrəti – İsa(s) sözünə Allahın bəndəsi olduğunu söyləməklə başlayıb Allaha ibadət etməyə əmr olunduğunu deməklə bitirmişdir. Bu surənin («Məryəm») 36-cı ayəsində İsanın(ə) dilindən belə oxuyuruq: «Allah həm mənim Rəbbim, həm də sizin Rəbbinizdir. Yalnız Ona ibadət edin, doğru yol budur».

Həzrəti İsaya(ə) nazil olan kitabın adı İncildir(müjdə verən). Həmçinin onu da qeyd edək ki, İsa(ə) 4 diri peyğəmbərdən biridir və səmada dördüncü göydə qərar tutmuşdur. Ustad şair M.Füzuli İslam peyğəmbəri Həzrəti – Məhəmmədi(ə) vəsf edərkəq onu İsa(ə) peyğəmbərlə müqayisə etmiş və İslam peyğəmbərinin daha əzəmətli və vüqarlı olduğunu qeyd edərək demişdi:

*Böyüksən, şöhrətin vəsf etməyə bir ölçümüz yoxdur,*
*Yetişməz rütbənə dördüncü göydə İsiyi Məryəm.*

Qərbin tanınmış böyük alimlərindən biri olan Maykl Hart da «Dünyanı dəyişdirmiş 100 nəfər» adlı kitabında yazır: «Mən dünyada olan 100 nüfuzlu şəxsin adını yazıb kompütерə verdim. Birinci yerdə İslam Peyğəmbəri Həzrəti Məhəmməd ibn Abdullahın(s) ikinci yerdə Ümumdünya Cazibə qanunun kəşf edən İ.Nyutonun, üçüncü yerdə Məryəm oğlu İsanın(ə) adı gəldi…».

Qurani Kərimin «Maidə» surəsinin 114-cü ayəsində oxuyuruq: «Məryəm oğlu İsa(ə) dedi: «Ya Allah, Ey bizim Rəbbimiz, bizə göydən bir süfrə nazil et ki, o bizim həm birincimiz, həm də axırıncımız üçün bir bayram və Səndən bir əlamət olsun. Bizə ruzi ver ki, Sən ruzi verənlərin ən yaxşısısan!».

Bu ayənin izahı barədə təfsir alimlərindən olan Ayətullah-üzma Nasir Məkarim Şirazi yazır: Ayənin orijinal mətnindəki «eyd» «aud» kəlməsindən götürülmüş, mənası «qayıdış» deməkdir. Buna görə də xalq və cəmiyyətin çətinliklərdən çıxıb əvvəlki rahatlıqlarına qaytdıqları günlərə eyd-qayıdış deyilir. İslam bayramlarında insan mübarək Ramazan ayının ibadət və itaətləri sayəsində (Fitr bayramı) və ya Həccin vacib əməllərini yerinə yetirdikdən sonra (Qurban bayramı) ilk fitri, paklığı və səfası ruhuna və canına qayıtdığı, fitrətə zidd olan çirkinliklər ortadan qalxdığı üçün onlara eyd-qayıdış deyilir. Süfrənin

endirildiyi Allaha iman səfasına qayıdış günü olduğu üçün Həzrəti İsa(ə) həmin günü «eyd» (bayram) adlandırmışdır. Hədislərdə süfrənin bayram günü endirildiyi qeyd edilir. Bəlkə də xristianlarda bazar gününə hörmət göstərilməsinin səbəblərindən biri də budur. İmam Əlinin(ə) bir hədisində belə deyilir: Allaha günah edilmədiyi gün bayramdır. Çünki, günahın tərk edildiyi gün qələbə, paklıq və ilkin fitrətə dönüş günüdür. Ayədən başqa bir nüans da başa düşülür: belə ki, insanlara böyük bir rəhmət nəsib olarsa, həmin günü rəsmi bayram elan etmək olar. Həzrəti İsa(ə) da süfrənin endirildiyi günü öz davamçıları üçün bayram etmişdi ki, hər il həmin günü bayram keçirsinlər. Bu məntiqlə, Peyğəmbərin(s) doğulduğu, peyğəmbərliyə seçildiyi və ya insanlar üçün mənəvi və əzəmətli süfrənin endirildiyi hesab edilən hər bir gün bayram təyin edilə bilər. Çünki, belə günlər səmavi süfrənin həvarilərə endirildiyi gündən qat-qat bərəkətlidir. İmam Baqir(ə) buyurmuşdur: İsrail oğullarına nazil edilmiş süfrə göydən qızıl zəncirlərlə aslmış və orada 9 ədəd balıq, 9 ədəd çörək olmuşdur. S.M.Təbatəbai(«Əl-Mizan» təfsiri, 6-cı sild, səh.37. Ayətullah Üzma Nasir Məkarim Şirazi səh.127).

**Həzrəti İsa(ə) İslam peyğəmbərinin gələcəyini müjdə vermişdir**

Qurani – Kərimin «Səff» surəsinin 6-cı ayəsində buyurulur: Bir zaman Məryəm oğlu İsa(ə) demişdi: Ey İsrail oğulları! Mən Allahın sizə göndərdiyi, məndən əvvəl nazil edilmiş kitabı (Tövratı) təsdiqləyən və məndən sonra

gələcək Əhməd adlı elçisi ilə (sizi) müjdələyən bir elçisiyəm!» O, (Əhməd) onlara açıq-aydın dəlillər və möcüzələr gətirdikdə onlar: Bu aşkar bir sehrdir dedilər». Ayənin izahı barədə təfsir alimlərindən olan Ayətullah üzma Nasir Məkarim Şirazinin  Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı barədə  kitabında oxuyuruq: «Bu ayədə sözü gedən müjdənin İsaya göndərilən səmavi kitabda olduğu qeyd edilməsə də Quranın başqa ayələrində («Əraf»157) onun məhz İncildə olduğu qeyd edilmişdi. Əlbəttə, bu gün yahudi və xristianların əlində olan İncil və Tövrat heç də Musa(ə) və İsaya(ə) göndərilmiş səmavi kitablar deyil. Əslində bu gün mövcud olan İncil və Tövrat adı çəkilən peyğəmbərlərin dostları və ya onlardan sonrakı dövrlərdə yaşamış insanların yazdığı kitabların toplusudur. Bu topluya ümumi şəkildə nəzər saldıqda iddiamızın  doğruluğunun heç bir şübhə doğurmadığının şahidi oluruq. Yahudi və xristianların özləri də bunu danmırlar. Bununla belə, şübhəsiz ki, Musa(ə) və İsaya(ə) öyrədilənlərin, eyni zamanda səmavi kitablarda yer almış məzmunların bir qisminin adı çəkilən peyğəmbərlərin davamçıları tərəfindən həmin kitablarda  yazıya alınmışdır. Buna görə də Əhtiətiq (Tövrat) və  Əhti-cədiddə(İncildə) yazılanların hamısını nə qəbul, nə də inkar etmək olar. Bu kitablarda Musa(ə) və İsaya(ə) göndərilmiş təlimatlar başqalarının fikir və düşüncələri ilə qarışdırılmışdır. Bu gün mövcud olan kitablarda da böyük bir peyğəmbərin gələcəyi ilə bağlı çoxlu müjdələrin verildiyinin şahidiyik. Həmin müjdələr isə yalnız İslam peyğəmbərinə aiddir. Bu nüansı da qeyd

etməliyik ki, bu kitablarda yer almış və əvvəlki peyğəmbərlərin dilindən olan qabaqcadan verilmiş xəbərlər və onların İslam Peyğəmbərinin(s) əlamətləri ilə üst-üstə düşməsi ilə yanaşı, İohanın «İncil»inin üç yerində işlədilmiş və mənası «təsəlli verən» olan «farqlit» xüsusi diqqət çəkir. Belə ki, yunanca orijinaldan götürülmüş Siryani dilindəki İncillərdə «təsəlli verən» sözünün yerinə yunanca mənası «təriflənən» və «tərifə layiq olan» «farqlit», yunanca orijinalda «Perkletus» sözləri işlədilmişdir. Bu sözün ərəbcə qarşılığı isə Mühəmməd(s) və ya Əhməddir(s). Kilsə rəhbərləri bu cür tərcümələrin onların təşkilatlarına güclü zərbə vuracağını gördükdə «Perkletus» sözünün əvəzinə tərcüməsi «təsəlli verən» olan «Parakletus» sözünü yazmış, kobud bir təhrifə yol verərək bu canlı sənədi dəyişmişlər. Qeyd olunan təhrifə baxmayaraq həmin kitablarda gələcəkdə böyük bir zühurun baş verəcəyi ilə bağlı aşkar bir müjdə də yer almaqdadır. Əhməd İslam Peyğəmbərinin(ə) məşhur adlarından biridir. O, həyatda olarkən bu adla şöhrət tapmışdır. Buna görə də sözügedən ayələr nazil olanda düşmənlərin heç biri Onun adının Əhməd olmasına etiraz etməmişlər. Çünki, bu ad artıq hamıya məlum idi. («Nümunə» cild 24,səh.73; «Əl-Mizan» cild 19,səh.261; Ayətullah üzma Nasir Məkarim Şirazi «Təfsir»,səh 552).

**İslam peyğəmbərinin zühuruna müxtəlif dinlərdə olan müjdələr**

Ulil-əzm(birinci dərəcəli) şəriət sahibləri olan peyğəmbərlərdən ikincisi Həzrəti –İbrahim(ə) Xəlilullahdır. Həzrəti – İbrahimin sühufunun 3-cü fəslində qeyd olunur: a) Peyğəmbərlik onun vücudu ilə başa çatacaqdır. O, öz zühuru ilə Allah-təalanın rəhmət və bərəkətini yer üzündə yayacaq.

b) Ey İbrahim, Məhəmməd (s) və onun vəsilərinə salavat və salam göndər (Məhəmməd(s) və 12 İmam).

2. Həzrəti- Musa(ə) Tövrat – Xəlqət kitabı( fəsil 2-12) Allah İbrahimə dedi: Sənin nəslindən böyük bir ümmət yaradaram və sənin adını ucaldaram. O, Hera dağında sakin olacaq».

Həzrəti Süleymanın kitabı. Fəsil 5-16: «O Məhəmməddir ki, ağzı şirin olsun. Onun 12 canişini, möcüzələri var və 12-cisi Allah-təalanın əmri ilə (bir göy səsindən) sonda qiyam edəcək».

Əmiya Peyğəmbərin kitabı. (Fəsil 10-42): «Allah təalanı yeni bir dinlə zikr edər və onun səltənəti özündən sonra başlanar, adı Əhməddir(s)».

5. Həzrəti –İsa(ə) «İncil» -Bornaba (fəsil 33-41). «Allah Adəmə(ə) bir yazı yolladı. Onda «la iləha, illəllah, Mühəmmədun rəsulullah» yazılmışdı».

S.K.Pərpənci «Üsulliddin»2019,səh62-63, həsən Hüseynov «Sığın Haqq dərgahına (məqalələr toplusu)» I cild səh.107.

Təfsiri-«Nümunə»nin sahibi «Ənisül-əlam» kitabından nəql edərək yazır: «Cənab Fəxrül- İslam müsəlman olmazdan əvvəl xristian dinində ən böyük keşişlərdən birinin tə-

ləbəsi və xidmətçisi olmuşdur. Bir gün ustadının xəstə olmasına görə tələbələrə dərs deməyə o gedir. Orada tələbələrin «Farqalita» adı üzərində mübahisə etdiyini görür. Evə qayıtdıqda mövzunu ustadına izah edərkən keşiş ağlayıb deyir: Bu kəlmə yunan dilində «perklatus» deyilən Siryani sözüdür. Keşiş ah çəkdi və dedi: «Bunu yalnız alimlikdə sabitqədəm və möhkəm olanlar bilir. Mən çox israr etdim ki, onun mənasını mənə açıqlasın və onun sirr kimi saxlayacağıma and içdim. Keşiş dedi:

- Bunu bilsələr məni öldürərlər.

Söz verdim ki, adın gizli qalacaq. Otaqlardan birinin açarını verdi. Mən o otağın açarını heç vaxt görməmişdim. İki kitab adı çəkdi. Biri yunan, digəri siryani dilində yazılmışdı. Hər iki kitabda «farqalita» kəlməsi «Əhməd və Məhəmməd» mənalanmışdı. O, dedi:

İstisnasız xristian alimləri İslam peyğəmbərinin besətindən (peyğəmbərlik məqamına çatması) öncə bir kəlməni belə mənalandırıllar ki, o həzrətin(s) zühurunu gözləyirdilər. Lakin, zühurdan sonra öz rəisliklərindən əl çəkə bilməyiblər. Mən də onlar kimi. Fəxril-islam sözünə davam edərək yazır:

Dedim: «Elə isə indi təklif nədir?». Ustad cavab verdi:

- İslam dinindən başqa dinlər nəsx olunub. Bu cümləni üç dəfə təkrar etdi. Mən dedim: «bəs qurtuluş yolu hansı yoldur?». Dedi:

- Yalnız İslam Peyğəmbərinə(s) itaət etmək. Sonra ağladı. Dedim :

- Ay ruhani ata, İslam dininə daxil olmağa icazə verirsənmi? Dedi:

- Əgər axirət və qurtuluş istəyirsənsə yalnız yolu budur. Mən də sənə duaçı olacağam. Bu şərtlə ki, Qiyamət günü mənim də müsəlman olduğuma şahid olasan. Lakin, fanatik insanların qorxusundan və habelə riyasətə xatir onu bəyan etməyə acizəm».

(S.K.Pərpənci «Üsulliddin»2019,səh62-63, həsən Hüseynov «Sığın Haqq dərgahına (məqalələr toplusu)» I cild səh.107).

Qurani-Kərimdə də Allah təala «Ali-İmran» surəsinin 19 və 85-ci ayələrində Allah qatında həqiqi din İslam olduğunu buyurmuşdur. Ömrünü dini-Mustafa yoluna həsr edib və Həzrəti-Əlinin(ə) əqidə və məsləkinin daşıyıcısı olub 235 illik tarixi olan Azərbaycan Səfəvilər dövlətinin banisi Ş.İ.Xətai də bu deyilənləri təsdiqləyir və qəzəllərinin birində yazır:

*Din Məhəmməd dinidir, səlla-əla-sahib vüqar.,*
*Kövsərin suyun verən şahım Əlidir, şəhsuvar.*

(Ş.İ.Xətai «Keçmə namərd körpüsündən» Bakı. «Yazıçı»1988.səh59)

Son olaraq qeyd edək ki, səmavi kitabımız olan Qurani-Kərimdə Peyğəmbərimizin(s) mübarək adı 5 dəfə çəkilib. Məhəmməd adı (həmdə layiq, həmd olunmuş) 4 yerdə, («Ali-İmran»-114, «Əhzab»-140, «Məhəmməd»-2 və

«Fəth»-29) Əhməd adı isə 1 dəfə, «Səff» surəsinin 6 ayəsində zikr olunmuşdur.

Dərbəndli şair Şüayi də qəzəlində deyir:

*O, Əhəddi, sən də Əhməd, götürülsə «mim» adından,*
*Aradan hicab açılsa, bir adın Xuda deyilmi?!*

(Ramiz Faseh.»S.İ.Nəsiminin seçilmiş bəzi şeirlərinin şərhi» Bakı «Şərq-Qərb»2007.səh.32.)

## MÜJDƏ BAYRAMI

«Ulil-əzm»(birinci dərəcəli) peyğəmbərlərlərdən sonuncusu İslam peyğəmbəri Məhəmməd ibn Abdullahdır(s). bu əzəmətli peyğəmbərin Qurani Kərimdə dörd dəfə Məhəmməd adı ilə, bir dəfə isə Əhməd adı ilə Allah təala zikr edib. Həmçinin Həzrəti-Peyğəmbər(s) Əhli-beytin(ə) ilk nümayəndəsi olmuş və məşhur hədislərdə buyurulduğu kimi Allah təala cənnət və səmaları Əhli-beytin(ə) adı və nuru ilə zinətləndirmişdir. Bu barədə İslam peyğəmbəri özü belə buyurmuşdur: «Cənnətin qapısının üstündə yazılmışdır: «Allahdan başqa məbud yoxdur. Məhəmməd(s) onun rəsuludur. Əli onun Onun vəlisidir. Həsən və Hüsen Onun şəfisidirlər. Fatimə Onun ən sevimli bəndəsidir. Onlara nifrət bəsləyənlərə Allahın lənəti olsun!».

Başqa bir hədisdə Rəsuli-əkrəmdən(s) elə nəql olunur: «Merac gecəsi Allahdan soruşdum, Ya Rəbbim, mənim

xəlifələrim kimdir?» allah təala buyurdu: «Ya Məhəmməd, sənin xəlifələrinin adı mənim ərşimdə yazılmışdır». Mən ərşə baxanda 12 nur gördüm. Hər bir nur üzərində olan göy örtükdə xəlifələrin adı yazılmışdır. Onlardan birincisi Əli ibn Əbu Talib(ə), axırıncısı isə ümmətimin Mehdisidir(ə.c.f)». Dedim: «Ya Rəbbim, bunlar məndən sonra xəlifələrdirmi?». Cavab gəldi: «Ya Məhəmməd, bunlar səndən sonra mənim ümmətim üzərində vəlilərim, höccətlərim və məxluqlarımdır». («Biharul-Ənvar»-c.26.səh.337).

Azərbaycan klassik ədəbiyyatının görkəmli simalarından olan Əhli-beyt(ə) aşiqi S.Ə.Şirvani də qurani kərimin Əhli-beyt(ə) barədəki ayələrinə və İslam peyğəmbərindən(s) nəql olunan hədislərə istinad edərək Əhli-beytin(ə) yüksək nüfuza malik olmasını belə vəsf edir:

Bar- ilahi, behəqqi –Ali- əba
Əfv qıl cürmümü, bağışla xəta.
Sənə bir əbdi -rusiyahəm mən,
Bəndeyi-asitani -şahəm mən.
Şahım ol Murtəzadır nuri-cəli,
Heydəri-şirdir, Əliyyu-vəli.
Bar-ilahi, behəqqi –Ali-Bətul,
Tövbəvü –üzrümü sən eylə qəbul.
(S.Ə.Şirvani.Seçilmiş əsərləri.3cilddə.Bakı 1966.səh.).

# NİKAH ƏQDİ

Bu kitabı yazmaqda əsas məqsəd oxucularımıza zilhiccə ayında olan bir sıra müqəddəs bayramlar haqqında məlumat verməkdir. Belə ki, bu ay hicri-qəməri təqviminin sonuncu ayıdır və zilhiccə ayının ilk günü dinimizin ideal şəxsləri olan Həzrəti-Əli (ə) ilə Fatimeyi-Zəhranın (s.ə) izdivac günüdür. Seyyid Əliəkbər Ocaq Nejad "Ümmi-Əbiha" kitabında bununla əlaqədar olaraq yazır ki, vəhy mələyi Cənabi-Cəbrail (ə) Peyğəmbərin yanına nazil olub buyurdu: "Ya Rəsulallah, Allah mənə vəhy etdi ki, bütün mələkləri Cənnətdəki "Sidrətül-müntəha" ağacının altına cəmləşdirim. Onların hamısı cərgə ilə dayandılar. Mən Fatimeyi-Zəhra (s.ə) ilə Həzrəti-Əlinin (ə) əqdini oxuyandan sonra, Allah o ağaca əmr etdi ki, öz meyvəsini mələklərə səpələsin. Hansı mələk həmin meyvədən götürmüşdüsə, o da fəxr etdi. Onlar fəxr etdilər ki, Fatimeyi-Zəhranın (s.ə) əqdinin oxunması münasibətilə bu ağacın meyvəsi onlara da qismət olub.

Cənabi-Cəbrailin bu sözündən sonra Həzrəti-Məhəmməd (s) öz qızı, iki dünya xanımı Fatimeyi-Zəhranı (s.ə) Allahın vəlisi, Peyğəmbərin (s) vəsisi və canişini, möminlərin əmiri Həzrəti-Əliyə (ə) ərə verir. Peyğəmbər (s) qızını əlinin evinə yola salarkən deyir: Ya Zəhra, əgər Əli olmasaydı, dünyada sənə layiq ər tapılmazdı".

İmam Cəfəri-Sadiq (ə) buyurur: "Əgər Əmirəl-mömi-

nin (ə) olmasaydı, Adəmdən qiyamətə qədər Fatimə (s.ə) üçün layiqli həyat yoldaşı olmazdı".

Böyük alimlərdən biri demişdir: "Mən həmişə düşünürdüm ki, nəyə görə İmam Əli (ə) Müqəddəs Kəbə evində dünyaya gəlib? Nəhayət ki, İmam Əli (ə) ilə Xanım Zəhranın (s.ə) izdivacı günü sualıma cavab tapdım: "Əgər gəlin Peyğəmbər (s) evindən çıxırsa, gərək bəy də Allahın evindən çıxsın".

Fatimeyi-Zəhra (s.ə) ilə evləndikdən sonra Həzrəti-Əli (ə) belə buyurmuşdur: "Mən fəxr edirəm ki, Fatimə kimi xanımla ailə qurmuşam. Fəxr edirəm ki, Allahın Rəsulu (s) məni onunla evləndirdi".

Əhli-beytdən (ə) gələn rəvayətlərin böyük əksəriyyətində Xanım Fatimənin (s.ə) Əli (ə) ilə evlənməsinin tarixi hicrətin ikinci ili zilhiccə ayının əvvəlinə təsadüf etdiyi göstərilmişdir. Həzrəti-Əli (ə) və Xanım Zəhranın (s.ə) evliliyi səmavi bir əmrin əsasında gerçəkləşmişdir.

O zaman bir çox adamlar Peyğəmbərin (s) qızıyla evlənmək istəyirdi, Ərəb böyüklərindən bir neçə adam da Xanım Fatiməni (s.ə) atasından istəmişdi, ancaq Xanım Fatimənin uca şəxsiyyəti digər insanlardan çox fərqli və üstün olduğu üçün bu kəslərin heç birisini qəbul etməmişdi.

Xanım Fatimə (s.ə) ancaq özü kimi uca bir iman və nümunəvi əxlaqa sahib biriylə evlənə bilərdi, belə biri də Həzrəti-Əlidən (ə) başqası ola bilməzdi.

İbn Əbil-Hədid belə deyir: "Həzrəti-Peyğəmbərin (s)

Əlini (ə) Fatimə (s.ə) ilə evləndirməsi Allahın göydə mələklərin şahidliyi əsasında onları evləndirməsindən sonra gerçəkləşmişdir".[1]

Cabir ibn Abdullahın belə dediyi rəvayət edilir: "Allah Rəsulu (s) Fatiməni (s.ə) Əli (ə) ilə evləndirdiyi zaman, Allah onları Ərşinin üzərində evləndirmişdi".[2]

İmam Mühəmməd Baqirdən (ə) belə rəvayət edilir: "Allah Rəsulu (s) belə buyurmuşdur: "Mən də sizin kimi bir insanam. Sizin içinizdə evlənir və sizləri evləndirirəm. Amma Fatimə (ə) istisnadır. Onun evlənməsi göydən gələn vəhylə gerçəkləşmişdir".[3]

Ənəsdən belə rəvayət edilir: "Allah Rəsulunun (s) yanında oturduğum zaman, ona vəhy nazil oldu və buna görə özündən getdi. Bir qədər sonra özünə gəlincə belə dedi: "Ey Ənəs! Cəbrayılın Ərşin sahibindən mənə nə gətirdiyini bilirsənmi?"

Dedim ki: "Allah və Rəsulu daha yaxşı bilər. Atam-anam sənə fəda olsun, Cəbrayıl nə xəbər gətirdi?"

Buyurdu ki: "Allah mənə Fatiməni Əli ilə evləndirməyimi əmr etdi. Get, mühacirləri və ənsarı mənim yanıma çağır."

Gedib mühacirləri və ənsarı çağırdım. Hər kəs oturduqdan sonra Həzrəti-Peyğəmbər (s) belə buyurdu: "Nemətlərindən yana həmd edilən, qüdrətindən yana ibadət edilən,

---

[1] "Şərhi-Nəhcül-Bəlağə" 9/193; Azacıq fərqlə "Zəxairul-Uqba", s. 40-41.
[2] "Biharul-Ənvar", 43/142.
[3] Yenə orada, 43/145.

səltənətindən yana itaət edilən, qatındakı nemətlərdən yana arzu edilən, əzabından yana çəkinilən, yerdə və göydə əmrləri qüvvədə olan, məxluqatı qüdrətiylə yaradan, hökmləriylə onları bir-birindən ayrı və fərqli edən, diniylə onları əziz edən, peyğəmbəri Mühəmmədə, onlara lütf edən Allaha həmd olsun. Heç şübhəsiz, Allah, evlilik yoluyla reallaşan qohumluğu, nəsəbin davamının vəsiləsi və qohumluğun bir növü qərar vermişdir. Allahın əmri qəzasına uyğun reallaşar, qəzası isə qədərinə söykənər. Hər təqdirin də bir müddəti vardır.

Həzrəti-Peyğəmbər belə buyurmuşdur: "Xəbəriniz olsun! Allah mənə Fatiməni Əli ilə evləndirməyimi əmr etdi. Əgər Əli buna razı olsa, mənim onu dörd yüz misqal gümüş qarşılığında Fatimə ilə evləndirdiyimə şahid olun."

Əli (ə) orada yox idi. Allah Rəsulu (s) onu bir iş üçün bir yerə göndərmişdi. Sonra Allah Rəsulu (s) içində təzə xurma olan bir qab gətirmələrini əmr etdi. Qabı önümüzə qoydu, "Yeyin" dedi. Biz təzə xurmaları yeyərkən Əli (ə) çıxıb gəldi. Allah Rəsulu (s) ona baxıb gülümsədi, sonra belə buyurdu: "Ey Əli! Allah mənə, Fatiməni səninlə evləndirməyimi əmr etdi. Onu əgər qəbul etsən, dörd yüz misqal gümüş qarşılığında səninlə evləndirdim."

Əli (ə) belə dedi: "Razıyam, ya Rəsulullah!" Sonra Əli bir kənara çəkilib Allah üçün şükr səcdəsi etdi və daha sonra belə dedi: "Məni məxluqatın ən xeyirlisi olan Rəsulullaha (s) sevdirən Allaha həmd olsun".

Allah Rəsulu (s) da belə buyurdu: "Allah ikinizə bərəkət

versin. Sizi bərəkətli etsin və sizə xoşbəxtlik əta etsin. Sizdən dünyaya çox sayda tərtəmiz, pak nəsillər bəxş etsin."

Ənəs deyir ki: "Allaha and içərəm ki, Allah, dünyaya onlardan çox sayda tərtəmiz, pak nəsillər gətirdi."[1]

Çoxsaylı rəvayətlərdə gəlmişdir ki, bu ilahi əmr, Allah Rəsuluna (s) buyurulduqdan sonra, O Həzrət, qızı Xanım Fatimənin (s.ə) yanına gedərək bu mövzudakı düşüncəsini soruşdu və Həzrəti-Fatimə (s.ə) də susaraq müsbət düşündüyünü ifadə etdi.

Beləliklə, Peyğəmbərin yeganə qızı, dünya və axirət qadınlarının ən üstünü Xanım Zəhra (s.ə), Peyğəmbər (s) evindən çıxaraq, Allahın evində dünyaya gələn, fəzilət qalalarının fatehi, Əmirəl-Möminin Əli ibn Əbu Talibin evinə və həyatına qədəm qoydu. Allahın salamı, rəhməti və bərəkəti bu uca şəxsiyyətlərin üzərinə olsun.

Belə bir rəvayət vardır ki, Peyğəmbər "Allahın ərşinin altında gizli bir xəzinə var, o xəzinənin açarı şairlərin dilinin altındadır" buyurmuşdur. Görkəmli Azərbaycan şairi Seyyid Məhəmmədhüseyn Şəhriyar Həzrəti-Əlinin (ə) dilindən yazdığı fəxriyyəsində Onun Xanım Fatimeyi-Zəhra (s.ə) ilə evlənməsindən fəxr duyduğunu belə obrazlı şəkildə qələmə almışdır:

Başımın tacı, canım məbədi Zəhrayə ərəm,

---

[1] "Kifayətut-Talib", bab: 78, s. 298; "Əl-Mənaqib", 3/351, Həzrəti-Fatimənin evliliyi; "Kəşful-Ğimmə", 1/348-349; "Zəxairul-Uqba", s. 41.

Böyük Həq bəxşişi tək mən onu candan sevərəm.

Dini-islami qəbul eyləyən ilkin nəfərəm,
Ərəbin vur əliyəm, zalimi-rəf'i-xətərəm.

Od vurub küfrün evin şurü şərin söndürərəm,
Qızmış aslan, qılınc əldə qəzavü qədərəm.

Allahın elçisinə bağlı, ona can-cigərəm,
Az yaşımdan onun əhkamını əzbər bilərəm.

Mən hüda nəxli budağındaki şirin bəhərəm,
Cəbrəil şəhpəri başım üzərində, gəzərəm.

İki oğlum da ki Zəhradan olub, fəxr edərəm,
Atası söylədi "damad" mənə, bəxtəvərəm.

Bədrdə enməz igid, mənbeyi-hövlü həzərəm,
Mən Yəmən, həm də Ühüddə sanılan şiri-nərəm.

Etdi Peyğəmbər əli başıma bu taci kərəm,
Dürrətül-taci-imamətdə papaq, həm kəmərəm.

Mənəm islamın ələmdari ki, sahibhünərəm,
Əmri qətlə yetirən, zalimi-rəf'i-xətərəm.

Xaliqin qəhr oduyam, küfrü külə döndərərəm,

Nadi-Əli məzhəri, ayineyi-şövqül-qəmərəm.

Sağəri-şəhdi dolu huri əlindən içərəm,
Həm qılınc cövhəri, saflıqda işıqlı səhərəm.

Əliyəm, şahi-vilayət, iki aləm ağası,
Elm şəhridi Peyəmbər, mən onun darvazası.

***Bismillahir-Rəhmanir-Rəhim!***

**Ya Allah (c.c), Ya Məhəmməd (s),**
**Ya Əli (ə) səndən mədəd!**

*Quran! O bizim rəhbərimiz, bürhanımızdır,*
*Əyriylə düzü seçmək üçün mizanımızdır.*
*(Həmid Nitqi)*

İslam dinində olan əziz bayramlardan ikincisi zilhiccə ayının 10-u Həzrəti-İsmailin (ə) adı ilə bağlı olan "Qurban bayramı"dır. Müsəlman aləmi hər il müqəddəs və mübarək bir bayram gününü təntənə ilə qeyd edir. Qapılarda, ocaq və pirlərdə İsmail (ə) adına qurbanlar kəsilir, ehsanlar verilir. Bəşər həzin, kövrək hadisələri çox eşidib. Tarix hüznlü yaşantıları çox yaşayıb. Amma beləsini nə bəşər, nə tarix eşitməyib.

*Tərki-təcrid oldum, tökdüm qəbayi,*
*Əynimə geyindim şalü əbayi,*
*Mana sorun, kimdən aldım yasayi?*
*İsmailə enən qurbandan aldım.*

Bu qiymətli kəlamın müəllifi şeir və qəzəlləri ilə yanaşı cəmi 38 illik həyat fəaliyyəti ilə bütöv bir xalqın yaddaşı-

na əbədi həkk olan, Azərbaycan səfəvilər dövlətinin banisi, görkəmli din xadimi və şair, Əhli-beyt aşiqi (ə) Ş.İ.Xətaidir. Aşıq Qurbani onu belə xatırlayır:

*Gözəl şahim şeyx oğlıdır,*
*Şah Xətai, Şah Xətai!*
*Şahi-Mərdana bağlıdır,*
*Şah Xətai, Şah Xətai!*

Qurban bayramı İbrahimin (ə), İsmayilin (ə) və Hacərin imtahana çəkildiyi gündür. Bu imtahan tarix boyu təkrar olmuşdur, mahiyyəti bir-birinə bənzəməsə də, ancaq üslubu bənzəmişdir. Belə hadisələrdən biri də Kərbəla hadisəsidr. İmam Hüseyn (ə) Hz. İbrahim (ə) kimi (ə), Xanım Zeynəb (s.ə) Hacər kimi və İmamın övladları və yoldaşları İsmayil (ə) kimi imtahana çəkildilər.

Bu İlahi gücə malik olan böyük insanların sirri onda idi ki, onlar Məhbublarının razılığını əldə etmək üçün ürəklərindən Allahdan qeyrisini çıxartmışdılar ki, pak halda Məhbubları ilə görüşə bilsinlər. Ona görə də Qurban bayramı - qürb vasitəsidir. Allahdan qeyirisini Onun yolunda qurban vermək günüdür.

Əslində insan öz tamah boğazını kəsər və malından bir qədərini ayıraraq, riza və təslim məqamı ilə Allaha hədiyyə verər. Şübhəsiz ki, Allah bu qurbandan bəhrə aparmaz. Necə ki, bu ayə buyurur: "Allaha əsla onların əti və qanları çatmaz, əksinə Ona sizin tərəfinizdən (qəlb və batində

olan) təqva çatar" ("Həcc" surəsi, ayə 37)[1].

İnsan bütün il boyu özü üçün çalışır və ancaq öz mənafeyini düşünür. İslam yoxsulluğu aradan qaldırmaq üçün buyurur ki, il boyu özün yemisən, ildə bir günü qurban kəs və yoxsulları yedizdir ki, onlar da sevinsin. Bəli, dinimiz insan yetişdirən belə bir dindir. Bu gözəl bayram günündə öz batinimizə diqqət edək və tamahımızı, hərisliyimizi, acgözlüyümüzü qurban edək.

"Ulul-əzm" (1-ci dərəcəli) peyğəmbərlərdən biri də Həzrəti-İbrahimdir (ə). O, xalası qızı Sara xanımla ailə qurmuşdu. Lakin Sara ilə neçə illər yaşamalarına baxmayaraq övladları yox idi. Bir gün Sara xanım öz kənizi Hacəri Həzrəti-İbrahimə (ə) bağışladı ki, ondan övladı olsun.

Beləcə, İbrahim peyğəmbər (ə) Hacərlə evləndikdən sonra onlara bir oğul əta edildi, adını İsmail qoydular. Beş ildən sonra Saranın da bir oğlu oldu, adını İshaq qoydular. Saranın oğlu olduqdan sonra Hacərə təhəmmül edə bilmirdi. Bir gün o, Həzrəti-İbrahimə (ə) dedi: "Hacəri mənim gözümdən uzaq elə".

Allahın əmri ilə Həcc mövsümü gəldikdə Həzrəti-İbrahim (ə) Hacəri oğlu İsmail (ə) ilə birlikdə aparıb Məkkədə qoydu və qayıtdı.

Bir müddətdən sonra onların suyu qurtarır. İsmail (ə) susuzluqdan taqətdən düşüb uzanmış, dabanlarını yerə sürtürdü. Hacər isə Səfa və Mərvə dağları arasında qaçaraq su axtarırdı. Hacər İsmaildən (ə) nigaran qaldığına gö-

[1] Bax təfsirə.

rə tez-tez gəlib ona baş çəkirdi. Bu dəfə gələndə gördü ki, uşağın dabanı olan yerdə bir çuxur əmələ gəlib, oradan su çıxır. Hacər suyun axıb qurtarmasından qorxub, onun ətrafına torpaq yığaraq dedi: "Zəm-zəm", yəni "dayan-dayan". Su dayandı və o vaxtdan suyun adı "Zəm-zəm" oldu. Əgər Hacər onu dayandırmasaydı, axar suya çevrilərdi.

"Zəm-zəm" suyu Məkkədə zahir olandan sonra o nahiyədə yaşayan Curhum qəbiləsi Hacərin razılığı ilə gəlib Məkkədə məskunlaşdılar. İsmail (ə) o qəbilədən Ümarə adlı bir qızla evləndi. Sonra Həzrəti-İsmailin (ə) anası Hacər vəfat elədi. İbrahim (ə) gəlib onu Kəbənin yanında dəfn etdi.

**"Biharül-Ənvar", c.59. səh.26*

Rəvayətə əsasən, Həzrəti-Nuhun (ə) tufanında Kəbə zədələnmişdi. Allah-təalanın əmriylə İbrahim peyğəmbər (ə) onu təmir elədi. Bu zaman İsmail (ə) ona daş verərək kömək edirdi. Kəbənin divarı ucalanda, İbrahim (ə) böyük bir daşın üstünə çıxıb divarı tikirdi. Onun ayaqlarının izi həmin daşda nəqş bağladı və həmin daş indi də Kəbənin ətrafında qoyulub və "Məqami-İbrahim" adı ilə məhşurlaşıb.

İldə bir dəfə "Qurban Bayramı" yurdumuza qədəm qoyur. İslam dünyasında müqəddəs sayılan İsmail qurbanı. Allah-təala *"Bəqərə"* surəsinin 124-cü ayəsində buyurur: "Rəbbi İbrahimi (ə) bir neçə işlə sınadı, o da onları bütünlüklə yerinə yetirdi. Allah buyurdu: "Mən səni insanların imamı etdim". Dedi: "Uşaqlarımıdamı?" Buyurdu: "Mə-

nim əhdim zalımları ehtiva etməz”.

Allah-təala Peyğəmbərlik və Xəlillik (Allahın dostu) rütbələrindən əlavə İbrahimə (ə) daha yüksək rütbə vermək istəyir, ona görə də onu müxtəlif yollarla sınağa çəkir. İbrahim (ə) əvvəl Nəmrud tərəfindən oda atılır. Bu imtahandan baş ucalığı ilə qalib çıxdıqdan sonra imamlıq rütbəsinə layiq olur. Bu sınaq imtahanın bir mərhələsidir. Rəvayətlərdə deyilir ki, Həzrəti-İbrahimi (ə) oda atdıqda, Cəbrail (ə) o Həzrətin (ə) qulluğuna yetişib “Hacətin varmı?” deyə soruşur, İbrahim (ə) buyurur: “Hacətim var, hər bir yaranmış möhtacdır, lakin sənə yox, yeganə olan Allaha ehtiyacım var”. S.İ.Nəsimi deyib:

*Sən özünü dərk eləsən, haqq sirrini dərk edərsən,*
*Haqq, özünü dərk edənə, Cəbrayılı eylər nökər.*

İbrahimin (ə) birinci imtahanı bu oldu ki, belə çətin şəraitdə möhtac əlini hətta vəhy mələyi Cəbrayıla (ə) da uzatmadı, köməyi Allahdan istədi və qalib çıxdı.

Sınağın başqa bir mərhələsində İbrahimə (ə) əmr olunur ki, ailəsini və oğlu İsmaili otsuz-susuz bir yerə, “Hicaz” səhrasına aparıb Məkkədə məskunlaşsın. İbrahim (ə) bu əmri də qəbul edir və Allah-təalanın razılığı naminə hicran (ayrılıq) dərdinə dözür. Hacər oğlu İsmail ilə susuz səhrada qalan zaman Allahın hökmü ilə Məkkədə “Zəm-zəm” çeşməsi qaynayır. O nahiyyədə yaşayan Curhum qəbiləsi Hacərin razılığı ilə gəlib Məkkədə məskunlaşır.

Bu barədə “Səffat” surəsi 102-107-ci ayələrdə buyuru-

lur: "Atası ilə birlikdə işləyəcəkləri yerə çatdıqda dedi: "Oğlum, yuxuda gördüm sənin başını kəsirəm. Buna sən necə baxırsan?" Dedi: "Ata, məmur olduğunu yerinə yetir. Allah istəsə məni dözümlülərdən görərsən". "İkisi də təslim olunca, onun alnını yerə söykədi". "Biz nida verdik, Ey İbrahim!" "Yuxunu gerçəkləşdirdin və biz yaxşı iş görənləri belə mükafatlandırırıq". "Bu açıq bir sınaq idi". "Və onun məzyəsinə böyük bir qoç verdik"

Quran ayələrindən göründüyü kimi İbrahim (ə) oğlu İsmailə (ə) deyir: "Oğul! Mən dəfələrlə yuxuda eyni şəkildə görürəm və bilirəm ki, bu adi yuxu deyil. Bəlkə bir vəhydir. Mən Allahın əmriylə sənin basını kəsirəm. İbrahim (ə) bu mətləbin fəlsəfəsindən agah deyildi. Lakin yəqin bilirdi ki, bu iş Allahın əmridir. Bəs İbrahimin (ə) oğlu İsmail (ə) atasının bu yuxusuna necə cavab verir? İnsan belə fikirləşə bilər ki, İsmail (ə) demişdir: "Ata bu yuxudur! Yuxuda birinin başını kəsmək, ona həyat vermək və onun ömrünü uzatmaq deməkdir. İnşallah, mənim ömrüm uzun olacaqdır". Bu adi insanın təfəkkürü ola bilər. Lakin həm İbrahim (ə), həm də oğlu İsmail (ə) Allah məktəbinin yetirmələridir. "Səffat" surəsinin 102 ayəsinə nəzər salarkən bir daha bunun şahidi oluruq və görürük ki, İsmail (ə) atasının ona söylədiyi vəhydən ibarət olan yuxunun cavabında deyir: "Ata! Bu mətləb Allah tərəfindən gəlib və Allahın vəhyidir və ona görə kifayət edər". İbrahim Peyğəmbər (ə) oğlu İsmaili (ə) götürüb Mina dağında qurban kəsməyə apardı. Aşıq Məhbub Xəlili bir divanisində deyir:

*124 min gəldi, getdi, İbn Əbdullah gözəl,*
*Müşkülləri həll eləyən ol Vəliyyullah gözəl.*
*Yapdı Kəbənin evini ol Xəlilullah gözəl,*
*Dedi: «Xudam, gətirmişəm İsmaili qurbanə mən!»*

Lakin İbrahim (ə) İsmailin (ə) başını kəsmək istədikdə bıçaq kəsmədi. Həzrəti-İbrahim (ə) nə qədər çalışsa da, bir şey hasil olmadı. İbrahim (ə) narahat halda bıçağı daşa çaldı. Bıçaq Allahın izni ilə dilə gəlib dedi: "Ya İbrahim, Xəlil deyir kəs, amma Cəlil (Allah) deyir kəsmə. Mən də, sən də Cəlilə tabeyik".

Əhli-beyt (ə) aşiqi, könüllər sultanı Şah İsmail Xətai "İsmail Qurbanı" haqqında gözəl bir gəraylı yazıb ki, onun bir bəndində deyir:

*Bıçaq dedi: "Haşa-haşa,*
*Neyçün çaldın məni daşa.*
*Daşı kəsdim başdan-başa,*
*Kəsməm İsmaili" dedi.*

Bu zaman Allah-təalanın vəhy mələyi Cəbrail (ə) asimandan nazil olub bir qoç gətirdi. Həzrəti-İbrahim (ə) oğlu İsmailin (ə) əvəzində həmin qoçu qurban kəsdi. İsmail (ə) bu halı görərkən üzünü asimana tutub öz Rəbbinə belə münacat etdi:

*İsmailəm, Haqq yolunda*

*Canımı qurban eylərəm.*
*Çünki bu can qurban Sənə,*
*Mən qoç qurbanı neylərəm?*

İbrahim (ə) İsmailin (ə) başını kəsərkən ona belə bir vəhy olunur: "İbarhim! Biz istəmirik ki, oğlunun başını kəsəsən, bizim hədəfimiz bu deyil. Onda fayda yoxdur. Hədəf bu idi ki, məlum olsun ki, sən və oğlun Allahın qarşısında və onun əmrinin qarşısında nə qədər təslimsiniz? Allahın əmrinə itaət etməyə nə qədər hazırsınız? Siz hər iki itaətə, keyfiyyətə, yəni itaət və təslimə qabilsiniz. Ata qurban vermək, oğul isə qurban olmaq hədəfinə yetişdi. Biz bundan artıq bir şey istəmədik. Oğlunun başını kəsmə!"

Bütün çətinliklərə dözən, bütün varını Allah yolunda qurban verən İbrahim (ə) kimi şəxslər başqalarına İmam və meyar olmalıdır. Peyğəmbərlərdən (ə) bəziləri bir sıra çətinliklərə dözüb sınaqlardan üzüağ çıxdıqdan sonra imamlığa çatdılar. "Səcdə" surəsinin 24-cü ayəsində buna işarə olunub: "Səbr etdikləri üçün biz onlardan, əmrimizlə haqq yolu göstərən rəhbərlər təyin etmişdik".

Həzrəti-İbrahim (ə) də belə səbr edənlərdən idi və bu sınaqda Allah-təalanın məqsədi İbrahim (ə) kimi şəxsləri yetişdirmək idi.

## QURBAN BAYRAMININ ƏMƏLLƏRİ

Qurban bayramı çox şərəfli bir gündür. Həmin günün bir neçə əməli vardır.

1. Qüsl etmək;

2. Bayram namazı qılmaq; bu namaz imamın zühuru dövründə vacibdir və camaatla qılınmalıdır. Amma imam qeybdə olduğu vaxt bu namaz müstəhəbdir və həm camatla, həm də fərdi qılına bilər. Qurban bayramı namazının vaxtı günəş qalxdıqdan günortayadəkdir.

Qurban bayramı namazı (Fitr bayrmı namazı kimi) iki rükətdir: birinci rükətdə Həmd və surədən sonra beş təkbir deyilir və hər təkbirdən sonra qunut tutulur. Beşinci qunutdan sonra növbəti təkbir deyilir.

Sonra rüku və səcdələr yerinə yetirilir. İkinci rükətdə isə dörd təkbir deyilir və hər təkbirdən sonra qunut tutulur. Beşinci təkbirdən sonra rüku və səcdələr yerinə yetirilir, təşəhhüd və salam deyilərək namaz başa çatır.

Qurban bayramının namazı Azan və İqamə oxunmadan niyyətlə başlayır.

Qurban bayramı namazı iki rükət qılınır. Birinci rükətdə "Həmd" (Fatihə) və surədən sonra beş təkbir (Allahu Əkbər) deyilir və hər təkbirdən sonra bir qunut tutulur. Beşinci qunutdan sonra yenidən təkbir deyilib ruku və ikinci səcdə yerinə yetirilir. İkinci rükətdə isə "Həmd" və

surədən sonra dörd təkbir deyilir və hər birinin arasında qunut tutulur.

Sonuncu qunutdan sonra təkbir deyilib birinci rükətdə olduğu kimi, rüku və iki səcdə yerinə yetirilir. Yaxşı olar ki, Qurban namazı ucadan və üstüaçıq yerdə qılınsın.

Birinci və ikinci Rükətdə "Həmd" surəsindən sonra istənilən surəni oxumaq olar. Amma yaxşı olar ki, birinci rükətdə "Həmd" surəsindən sonra "Şəms", ikinci rükətdə isə "Əla" surəsi oxunsun.

Namazdan sonra bu təkbirləri təkrar-təkrar demək: "Əllahu-əkbər, əllahu-əkbər, la ilahə illəllahu vəllahu-əkbər. Əllahu-əkbər və lillahil həmd, əllahu-əkbəru əla ma hədana. Əllahu-əkbəru əla ma rəzəqəna min bəhimətil ən'am, vəlhəmdu lillahi əla ma əblana."

Qurban bayramı namazı Zülhiccə ayının onuncu günü qılınır. Yaxşı olar ki, bayram namazı gün üfüqdən qalxdıqdan sonra qılınsın. Niyyət istənilən dildə edilə bilər.

Qurban bayramı namazının qunuqtunda istənilən duanı oxumaq olar (doğma ana dilində olsa belə). Amma bu dua oxunarsa, daha yaxşı olar.

Qunut: (Allahummə əhləl kibriyayi vəl əzəmə və əhləl cudi və-cəbərut və əhləl əfvi vər-rəhmə və əhlət-təqva və məğfirə. Əsəlukə bihəqqi hazəl yəumi əlləzi cəəltəhu lilmusliminə ida Və İl Muhəmmədin səllallahu ələyhi və alih zuxrən və şərəfən mə kəramətən və məzida. Ən tusəlliyə əla Muhəmmədin və ali Muhəmməd. Və ən tudxiləni fi kulli xəyrin ədxəltə fihi Muhəmmədə və ali Muhəmməd.

Və ən tuxricəni min kuli suin əxrəctə minhu Muhəmmədən və ali Muhəmməd. Sələvatukə əleyhi və alih. Allahummə inni əsəlukə xəyrə ma səələkə bihi ibadukəl muxləsun və əuzu bikə mimmastəfzu minhu ibadukəl muxləsun.

Qunutun tərcüməsi:

(Ey böyüklüyə və əzəmətə layiq olan Allah! Ey böyüklüyə və bəxşişə layiq olan Allah! Ey güzəşt və mehribanlığa layiq olan Allah! Ey bağışlanmağa və günahların üstünü örtməyə layiq olan Allah! Müsəlmanlara bayram qərar verdiyin bu günün xatirinə ki, Mühəmməd və onun ailəsinə şərəf və böyüklük nəsib etdin, Mühəmməd və Onun ailəsinə salam və salavat göndər. Məni Mühəmməd və onun ailəsini daxil etdiyin hər bir xeyrə daxil et və məni Mühəmməd və onun ailəsini çıxardığın bütün pisliklərdən çıxar. Ona və ailəsinə rəhmətin olsun. Allahım, tam ciddiyyətlə Sənə layiq olan bəndələrinin istədiklərini Səndən diləyirəm. Və Sənə layiq olan bəndələrin pənah gətirdiklərindən Sənə pənah gətirirəm).

Qurban bayramı gecəsi məğrib və işa namazlarından sonra, habelə bayram günü sübh namazından sonra yaxşı olar ki, bu zikrlər oxunsun:

(Allahu əkbər, Allahu əkbər, la ilahə illəllah, vallahu əkbər və lillahi həmd, Allahu əkbər əla ma hədana) - (Allah böyükdür, Allah böyükdür, Allahdan başqa Allah yoxdur, Allah böyükdür, bizi hidayət edən Allaha şükürlər olsun. Allah böyükdür!).

4. Qurban kəsmək; İslam şəriətinə görə, dəvə, inək, ke-

çi və qoyun cinsindən qurban kəsmək olar. Bunun sübutu Qurani-Kərimin “Həcc” surəsinin 28-ci və 34-cü ayələridir. Həmin ayələrdə qurbanlığın “ənam” adlanan ev heyvanlarından olması şərt sayılır.

Quranın “Ənam” surəsinin 143-144-cü ayələrində isə “ənam” qisminə aid heyvanların yuxarıda adıçəkilən dörd cinsdən olduğu vurğulanır. Qurbanlıq heyvan sağlam və nöqsansız olmalıdır. Kor, şikəst, axtalanmış, hər hansı bədən üzvündə qüsur olan heyvanı qurban kəsməyə icazə verilmir. Heyvan xəstə və zəif olmamalıdır, qocalıb əldən düşmüş olmamalıdır. Qurbanlıq heyvanın erkək olması daha münasibdir.

## QURBANLIĞIN ŞƏRTLƏRİ

Qurban-İslam aləmində ən möhtəşəm bayramlardan biridir. Bütün müsəlman aləmində hər il Orucluq ayı bitəndən 70 gün sonra qeyd olunur və adətən üç gün davam edir. Mərasimlərdə qoyun, qoç, inək, dana və ya dəvə kəsilir.

Qurban kəsilib kasıblara paylanılır. Hamıya bərabər pay verilir, qurban kəsən özü də bərabər pay götürə bilər. Ənənəyə görə dilənçi və kasıblar bayram günü ac qalmasınlar deyə bu gün mərasimlərə dəvət olunurlar.

Dini qurban kəsmə İbrahim peyğəmbərin (ə) həyatında baş verən hadisədən sonra yaranmışdır. Belə ki, yuxuda Allah-təala İbrahim peyğəmbərə (ə) oğlu İsmayılı (ə) qurban verməyi (onların Allaha inamını yoxlamaq üçün) əmr edir. İbrahim (ə) əsl dindar kimi Allahın əmrini yerinə yetirməyə hazır idi, İsmayıl özü də qurban olmağa razılaşır.

Allaha qəlbən yaxın və sadiq olduğunu sübut etmək istəyən İbrahim peyğəmbər (ə) oğlu İsmayılı (ə) qurban kəsməyə hazır idi. Lakin uca Allah bunu öz elçisinə rəva bilmədi və qurbanlıq üçün ona bir qoç göndərdi.

Buna görə də Qurban bayramında kəsilən qurbana "İsmayıl qurbanı" da deyirlər. Çox sevdiyi balasını Allah yolunda qurban verməyə hazır olması peyğəmbərin Allah qarşısında imanının, səmimiliyinin və mütiliyinin bariz sü-

butudur.

Odur ki, din tarixində dərin iz salmış bu hadisə Allaha inamın, dərin etiqadın nümunəsidir. Bu hadisə onu göstərir ki, insanlar Allahı sonsuz imanla sevməli və öz sevgilərində bu cür səmimi olmalıdırlar. Çətin anlarda Allahı da yada salıb, yaxşı zamanlarda Onu unutmaq möminə yaraşan hərəkət deyil!

**Qurban və onun hökmləri**

1.Qurban kəsmənin ibadət olduğuna dair dəlillər:

Quran: "Rəbbin üçün namaz qıl və qurban kəs!" ("Kövsər" surəsi, ayə 2).

Quran: "De ki: "Mənim namazım da, kəsdiyim qurban da, həyatım və ölümüm də aləmlərin Rəbbi Allah üçündür" ("Ən'am" surəsi, 162-ci ayə).

Quran: "Biz hər bir ümmət üçün bir qurbangah müəyyən etdik ki, Allahın onlara ruzi verdiyi dördayaqlı heyvanların üstündə (onları kəsdikləri zaman) Allahın adını çəksinlər ("bismilləh" desinlər)" ("Həcc" surəsi, ayə 34).

2. Qurbanın tərifi:

Qurban bayramı münasibətilə qurban günlərində (zilhiccə ayının 10-u, 11-i, 12-si və 13-ü) ibadət məqsədilə kəsilən heyvan.

3. Qurbanın hökmü:

Təkid olunmuş (vacibə yaxın olan) sünnətdir.

4. Qurban kəsilməsinin icra vaxtı:

Ay təqvimi ilə zilhiccə ayının 10-u bayram namazından sonra başlayıb zilhiccənin 13-ü gün batana qədərdir.

Qeyd: Qurbanı bu günlər əsnasında gecə vaxtı da kəsmək olar.

5. Qurbanlıq mal-qara:

Dəvə, öküz, keçi, qoç və ya qoyun.

Qeyd: 7 nəfər və bundan az adam pul qoyub 1 dəvə və ya 1 öküz kəsə bilər. Bu halda həmin qurbanlığın alınması üçün pul qoyan şəxslərin 7-si də qurban kəsmiş sayılır. Keçi, qoç və qoyun isə yalnız bir nəfərin pulu ilə kəsilməlidir.

6. Qurbanın qəbul olunmasının iki şərti:

a) İxlas: yəni, bu ibadət yalnız Allah üçün olmalı;

b) Mutəbəa: yəni, Peyğəmbərin (Ona və ailəsinə Allahın xeyir-bərəkəti və salamı olsun!) etdiyi kimi olmalıdır.

7. Kəsilən qurbanlıq üçün qoyulan şərtlər:

a) qurbanlıq heyvan halal pul ilə alınmalıdır;

b) şəriətin göstərdiyi heyvan cinsindən olmalıdır. Xoruz, dovşan və s.olmamalıdır;

c) kəsilən heyvanın yaşı nəzərə alınmalıdır, yəni, dəvə 5 illik; öküz 2 illik; keçi 1 ilik; qoç və ya qoyun 6 aylıq.

Qeyd etmək lazımdır ki, yuxarıda göstərilənlərdən də, çox yaşı olan heyvanı qurban kəsmək olar.

d) kəsilən heyvanlarda təkgözlük, axsaqlıq, xəstəlik, zəiflik və arıqlıq kimi eyiblər olmamalıdır.

8. Qurban kəsilərkən riayət olunan şərtlər:

İsmayıl Qurbanında kəsilən heyvanlarda bir sıra şərtlər vacib sayılır. Qurbanlıq kimi seçilən heyvan qoç, iribuynuzlu dana, yaxud da dəvə olmalıdır. Nəsil artımında dişi heyvanların müstəsna rolu olduğuna görə qurbanlıq hey-

vanın erkək olması daha üstün tutulur.

a) qurban həddi-büluğa çatmış, ağlı başında olan şəxs tərəfindən kəsilməlidir;

b) qurban kəsən şəxs müsəlman olmalıdır;

c) qurbanı kəsmək üçün niyyət olmalıdır;

d) qurban yalnız Allah üçün kəsilməlidir;

e) qurban kəsdikdə Allahın adı çəkilməli, yəni "bismilləh" deyilməlidir;

f) qurban Allahdan qeyrisinin adı ilə kəsilməməlidir;

g) qurban kəsici iti alətlə kəsilməlidir;

h) qurban şəriətin buyurduğu yerdən kəsilib qanı axıdılmalıdır;

i) qurbanlıq heyvan şəriətin icazə verdiyi heyvanlardan olmalıdır;

Qeyd: Bu şərtlərdən birinə riayət olunmazsa qurban qəbul olunmur.

9. Qurban kəsildikdə müstəhəb (bəyənilən) əməllər:

a) qurbanı qibləyə tərəf döndərmək;

b) qurbanı səliqəli və rahat şəkildə kəsmək;

c) dəvəni ayaq üstə, öküz və qoçu isə uzanan yerdə kəsmək;

d) bıçağı kəsilən heyvana göstərməmək;

e) "bismilləh" dedikdən sonra "Allahu əkbər" demək;

f) qurbanın qəbul olunması üçün dua etmək;

g) qurbanın kim tərəfindən kəsildiyini dillə tələffüz etmək;

Qeyd: Bu əməllərdən hər hansı birini tərk etmək qurba-

nı batil etmir.

10. Qurban kəsildikdə məkruh (bəyənilməyən) əməllər:

a) bıçağı heyvana göstərmək və ya onun gözünün qabağında itiləmək;

b) bir heyvanın gözünün qabağında o birisini kəsmək;

c) kəsilmiş heyvanın canı çıxmamaış hər hansı bir əzasını sındırmaq və s. bu kimi əməllərlə heyvana əziyyət vermək;

Qeyd: bu əməllərdən hər hansı birini etmək qurbanı, Qurban bayramının namazını batil etmir.

***<u>Kərbəlayi Tahir Fikri</u>***

Nə gözəl bayramdır bu bayram Allah,
Böyüklü-kiçikli sevinir ümmət.
Qurbanlıq vəhdəti artırır Allah,
Bu günə xüsusi edilir hörmət.

Ehsanlar paylanır bu günki gündə,
Hacılar ziyarət edir Kəbəni.
Dualar edilir Ərəfə günündə,
Allahsa əfv edir ehsan edəni.

Savabdır hər zaman yaxşılıq etmək,
Vardırsa imkanın səxavətli ol.
Mujdəli əməldir daim bölüşmək,
Sən də çalış hər an məlahətli ol.

İlahi, sevindir fəqirləri Sən,
Olmasın bir kasıb, ehtiyaclı kəs.
Sən gözəl surətdə ruzi verənsən,
Ələxsus sevinsin vardısa bikəs.

Mən odlar yurdunun azad oğluyam,
Arzumdur Şuşada kəsim qurbanı.
Əhli beyt aşiqi, Allah quluyam,
Qarabağın azad olsun hər yanı.

Qurbanlar kəsilsin cıdır düzündə,

İsa bulağından içim doyunca.
Ehsanlar verilsin bayram günündə,
Bütöv görüm yurdu yaşa dolunca.

***Kərbəlayi Rəşad***

Rəhmətin bir rəmzidir insanə Qurban bayrami.
Bəxş edir şadliq səfasin canə Qurban bayrami.

Bu həmin gündür ki, xeyli kimsəsizlər yad olur,
Sövq edir insanlari ehsanə Qurban bayrami.

Kimsə istər tarixin bilsin, bu gün hardan qalıb,
Hansi gündən iz salıb dövranə, Qurban bayrami.

İmtahan oldu Xəlilullah həmin gün, diqqət et,
Ta həmin gündən çıxıb meydanə, Qurban bayrami.

Əmr olub İbrahimə, İsmaili qurban kəsə,
Getdi Mina səmtinə mərdanə, Qurban bayrami.

İstədi İsmaili şeytan bu yoldan saxlasın,
Atdi İsmail daşi şeytanə, Qurban bayrami.

Xəncərə əl atdi İbrahim və lakin kəsmədi,
Gəldi qoç qurbanliq ol qurbanə, Qurban bayrami.

Bu mübarək bir günün həqqində çox hikmət də var,

Ayə-ayə həkk olub Qur'anə, Qurban bayrami.

Ey Rəşad, sən nəfsini qurban kəs Allah eşqinə,
Bəlkə tə'sir eylədi iymanə, Qurban bayrami.

## Qurban və Ğədir-Xum bayramları arasında nə kimi bağlılıq var?

Qurban sözü "qürb" sözündən olub, (Allaha) yaxınlıq mənasını ifadə edir. Bütün ibadətlərin ilk qəbul şərti də məhz "yaxınlıq" niyyətilə (qəsdi-qürbət) yerinə yetirilməsidir. Ən gözəl qurbanlıq nəfsani meyillərin öldürülməsi, qurban edilməsidir. Məhz belə bir ruhi paklıqdan sonra mütləq Vilayət vadisinə daxil ola bilərsən. Rəzil sifətlərinin başını kəsərək aludəliklərdən pak ol ki, Ğədir-Xumda təharətlə Əlinin (ə) vilayət bayramına daxil ola biləsən.

Deməmk, Qurban vilayətçiliyə giriş üçün müqəddimədir. Necə ki, Allah-təala İbrahimi (ə) bu kimi imtahanlardan sonra xalqa İmam seçdi. İsmailin (ə) imtahanı imamət və vilayət məsələsinə müqəddimə oldu. İbrahim (ə) soruşduqda ki "övladlarım necə", Allah "mənim əhdim zalımlara yetişməz" deyə buyurdu (“Bəqərə” 124). Məlum olur ki zülmkarlıqla vilayətçilik tərs mütənasibdir.

Ğədirlə zühur edən vilayəti-mütləqə (Əlinin hakimiyyəti) dini kamil edən son hissədir. Bizə yetişən bütün nemətlər vilayət kanalı ilə yetişir. Onsuz nə ibadətin mənası var, nə qoyun-quzu kəsməyin faydası.

Vilayətçilik – mərifətlə yaranan, məhəbbətlə dolu bir təslimçilikdir. Məhz, burada mərifət, məhəbbət və itaət arasında mənalı bağlılıq yaranır. İslamda hakim-rəiyyət

anlayışı yox, imam və ümmət anlayışı var. Ümmət öz rəhbərini sevə-sevə əmrinə tabe olur. Sevgi olmasa, tabeçilik zorladır, candərdidir, qorxu yaxud yaltaqlıq üzündəndir.

Vilayətçiliyin şərti nədir?

İlk şərti budur ki əməldə özünü onlara bənzədəsən. Aşiq özünü məşuq rənginə boyamağa çalışar. Gərək Əhli-beyt (ə) mədəniyyətini imanla qəbul edəsən. Bayağı Qərb "mədəniyyəti"nin qida borusunda həzm olunmayasan. İmam Əlinin (ə) məramına günah, laqeydlik yaddır.

Növbəti şərti budur ki, Əhli-beyt (ə) düşmənlərinə qarşı məhəbbət bəsləməyəsən. Təvəllanın o biri üzü təbərradır. Təbərrası zəif olanın təvəllası da sual altına gedir. Bir nəfər Həzrəti-Əlinin (ə) yanına gələrək, dedi: "Ya Əli, mənim sənə məhəbbətim var. Filankəsi də sevirəm (bu zaman Əlinin düşmənlərindən birinin adını çəkdi). Imam Əli (ə) cavabında buyurdu: "Ya görən ol, ya da kor!"

Peyğəmbər (s) buyurur: " Ya Əli! Əgər bir bəndə Həzrəti-Nuhun (ə) ömrü qədər ibadət etsə, Uhud dağı qədər qızılı olsa və onu Allah yolunda ehsan etsə, min dəfə Həccə getsə, Səfa və Mərvə arasında məzlumcasına öldürülsə, amma sənin vilayətini qəbul etməsə, o, cənnətin iyini duymaz və cənnətə daxil olmaz".

*"Biharul-Ənvar" c.27.səh.194.

**Bismillahir-rəhmanir-rəhim**

İslam dinində olan müqəddəs bayramdan biri də zilhiccə ayının 18-də keçirilən kamillik bayramı hesab edilən "Ğədir-xum" bayramıdır. Bu bayramı ilk dəfə islam peyğəmbəri (s) 632-ci ildə sonuncu "Vida" həccindən qayıdarkən Ğədir çölündə 120.000 hacının iştirakı ilə keçirmişdir. Həmin vaxt Novruz bayramına təsadüf etdiyindən ona "Cənabi-Əmir" bayramı da deyirlər. Həzrəti-Əlinin (ə) xilafətə Ğədir-xum günü Vəsi seçilməsi Novruz bayramı gününə təsadüf etmişdir. Əhli-təriqət şairi S.İ.Nəbati "görünür" rədifli şeirində bu hadisəni nəzmə çəkmişdir:

*Bəzmi-vəhdətdə bu gün özgə tədarük qurulur,*
*"Qul-kəfa" şahinə övradi-mübarək toxunur.*
*"Həl-əta" surəsi, "vən-nəcmü" təbarək oxunur,*
*"Vəz-züha" təxtinə soltan Şəhi-Mərdan görünür.*

"Həccətül-vida" Həzrəti-Peyğəmbərin (s) ömrünün sonunda Məkkəyə gedib son dəfə Kəbəni ziyarət etməsi ilə bağlıdır.

Hicrətin 10-cu ili Peyğəmbərin (s) son vida Həcci olmuşdur. Bu ildə baş vermiş hadisələrin ən mühümü də İslam Peyğəmbərinin (s) son həccidir. Bu ildə həccin əməl-

lərini yerinə yetirmək və onu xalqa çatdırmaq Allah-təala tərəfindən Peyğəmbərə (s) əmr olunmuşdur.

Həccə getmək xəbəri bütün Mədinəyə yayıldı. Zilqədə ayının 26-da İslam Peyğəmbəri (s) böyük bir karvanla "Şəcərə" məscidində ehram bağlayıb Məkkəyə yola düşdü. Peyğəmbər (s) Məkkənin evləri görünənə qədər, yəni yol boyu "Ləbbeyk, Əllahummə, ləbbeyk" zikrini tilavət edirdi. O, Məscidül-hərama "Bəni-Şeybə" qapısından daxil oldu. İslam Peyğəmbəri (s) həccin bütün əməllərini müsəlmanlara başa saldı. O, bir neçə yerdə, o cümlədən "Ərəfat" çölündə xütbə oxudu. Xütbəsini bu sözlərlə başladı ki: "Ey müsəlmanlar, bir-birinizin malına, canına, namusuna təcavüz etməyin. Qadınların sizin boynunuzda, sizin də onların üzərində haqlarınız vardır. Onlar Allah tərəfindən sizin əlinizdə əmanətdir. Sizlərdən ən yaxşısı odur ki, evdə ailəsi ilə xoşəxlaq ola..." Xütbə bu cür davam edir və Peyğəmbər (s) xütbəni bu cümlələrlə yekunlaşdırdı: "Bütün müsəlmanlar bir-birinə qardaşdırlar." Sonra Peyğəmbər (s) üzünü göylərə tutub dedi: "Ey Allahım, sənin əhdü peymanını ümmətimə çatdırdım".

İslam Peyğəmbəri (s) Mina əməllərini də yerinə yetirəndən sonra Mədinəyə qayıtdı. Həcdən qayıdan karvan Ğədir çölünə çatanda Cəbrail (ə) mühüm bir xəbəri Allah tərəfindən Peyğəmbərə (s) çatdırdı. (Onu da qeyd etmək lazımdır ki, Ğədir Cöhfənin yaxınlığında yol ayrıcında yerləşirdi). Həmin mühüm xəbər "Maidə" surəsinin 67-ci ayəsinin nazil olma xəbəri idi. Allah-təala buyururdu:

يَا أَيُّهَا الرَّسُولُ بَلِّغْ مَا أُنزِلَ إِلَيْكَ مِن رَّبِّكَ وَإِن لَّمْ تَفْعَلْ فَمَا بَلَّغْتَ رِسَالَتَهُ وَاللّهُ يَعْصِمُكَ مِنَ النَّاسِ إِنَّ اللّهَ لاَ يَهْدِي الْقَوْمَ الْكَافِرِينَ

"Ey Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil olanı (o məsələ ki, Allahın tərəfindən sənə çatıb) camaata çatdır ki, əgər bunu etməsən, Allahın risalətini yerinə yetirməmisən. Allah-təala səni camaatdan qoruyacaq. Həqiqətən, Allah kafir qövmi hidayət etməyəcək."

Bu ayə nazil olan gün Qurban bayramından səkkiz gün keçmişdi. Zilhiccə ayının 18-i idi. Hava çox isti idi, Cöhfə çölü görünür, onun ardınca isə Ğədir-Xum səhrası başlanırdı. Bura dörd yol ayrıcı idi, Misirə, Yəmənə, İraqa və Mədinəyə yollar burada ayrılırdı. Birdən Peyğəmbər (s) müsəlmanlara dayanmaq əmri verdi. Qabaqda gedənlər geri qayıtdılar. Peyğəmbər (s) müəzzinə azan verməsini əmr etdi və azandan sonra namaz qılındı.

Namaz qurtaran kimi müsəlmanlar dağılışmaq istədilər. Buna səbəb də havanın həddindən artıq isti olması idi. İstidən insanlar əbalarının bir hissəsini başlarına çəkməyə, o biri hissəsini isə ayaqlarının altına sərməyə məcbur olmuşdular. Peyğəmbər (s) göstəriş verdi ki, heç kim dağılmasın, ilahi bir xəbəri eşitmək üçün öz yerinizdə qalın. Sonra Peyğəmbər (s) əmr etdi ki, dəvələrin yəhərlərindən bir minbər düzəltsinlər.

Minbər hazır olan kimi Peyğəmbər (s) minbərin üstünə çıxdı və Allah-təalaya həmd-səna edəndən sonra buyurdu: "Ey camaat, tezliklə mən sizin aranızdan gedəcəyəm və

Allahıma qovuşacağam. Deyin, görüm, mənim barəmdə necə şəhadət verirsiniz?”

Hamı bir ağızla ucadan dedi: “Şahidlik veririk ki, həqiqətən, sən nəsihət vermiş, bizi düzgün yola hidayət etmisən. Allah sənə əcr əta etsin, ya Rəsulullah”.

Sonra Həzrət (s) buyurdu: “Siz Allahın birliyinə, mənim risalətimə, qiyamət gününə və o gündə hamının diriləcəyinə şəhadət verirsinizmi?”

Hamı dedi: “Bəli”.

Sonra Peyğəmbər (s) buyurdu: “İndi baxın, görün, sizə tapşırdığım iki qiymətli əmanət barəsində necə rəftar edəcəksiniz?”

Sual verdilər ki, hansı iki əmanət, ya Rəsulullah?

Peyğəmbər (s) buyurdu: “Mən sizin aranızda iki ağır əmanət qoyub gedirəm. Onlardan biri Allahın kitabı və ikincisi mənim Əhli-beytimdir (ə). Bu iki əmanət Kövsər hovuzuna qədər bir-birindən ayrılmazlar. Bu iki əmanətdən qabaq düşsəniz də ziyan çəkərsiniz, geri qalsanız da”.

Sonra Peyğəmbər (s) Əlini (ə) yanına çağırıb, onun əlindən tutub, hər ikisinin qoltuğunun altı görünənə qədər yuxarı qaldırıb buyurdu: “Ey camaat, Allah mənim rəhbərimdir, mən isə sizin rəhbərinizəm. Mən kimin rəhbəriyəm, Əli də onun rəhbəridir”.

Məşhur şair Həssan ibn Sabit Peyğəmbərdən (s) bu münasibətlə bir şeir söyləmək üçün icazə istədi, sonra belə dedi:

Yunadihim yovməl-Ğədiri Nəbiyyuhum,

Bi-Xummin və-əsmi bir-Rəsuli munadiyən.
Fəqalə, fəmən movlakum və nəbiyyukum?
Fəqalu, və ləm yəbdu hunakət-təamiyən,
İlahukə movlana və əntə nəbiyyuna,
Və ləm təlqi minna fil-vəlayəti asiyən.
Fəqalə ləhu, qum ya Əliyyu, fə-innəni,
Rəziytukə min bədi imamən və hadiyən,
Fə-mən kuntu movlahu, fə-haza vəliyyəhu,
Fəkunu ləhu ətbaə sidqin muvaliyən!
Hunakə dəa, Əllahummə, vali vəliyyuhu,
Və kun lilləzi ada Əliyyən muadiyən!

"Ğədir-Xumda Peyğəmbər nidası,
Yayıldı carçısıyla hər sədası.
Dedi: "Kimdir sizin mövla, nəbiniz?"
Bir ağızdan: "Allah bizim Rəbbimiz!
Ondan sonra sən də peyğəmbərimiz!
Vilayətə asi olmaz birimiz!"
Peyğəmbərin Əliyə buyruğuyla:
"Qalx ayağa, həqiqət sorağıyla.
Məndən sonra imam, hidayətçisən,
Mövlası olduğumun rəhbərisən!
Bəs, itaət edin buyruqlarıma,
Allahdan əmanət qoyduqlarıma!
Allah, Sən də sev, onu sevənləri
Düşməninə düşmən olsan, var yeri

Bu, şiə və sünni alimlərinin kitablarında nəql olunan "Qədir-Xum" hadisəsinin xülasəsi idi!

Peyğəmbər (s) bu sözü üç dəfə təkrar etdi, sonra üzünü göyə tutub belə buyurdu: "Ey mənim Allahım, kim onu dost tutsa, sən də onu dost tut, kim onu sevsə, sən də onu sev, kim onu düşmən tutsa, sən də onu düşmən tut, kimin ondan acığı gəlsə, sənin də ondan acığın gəlsin, kim ona kömək etsə, sən də ona kömək et, kim ona kömək etməsə, sən də ona kömək etmə, haqqı onunla yoldaş et və onu haqdan ayırma" (Həssan ibn Sabit).

Ömrünü Əhli-beytin (ə) və Kərbəla şəhidlərinin fəzilətlərinin vəsfinə həsr edən Mövlanə Mühəmmədbaqir Füzuli Bağdadi (r) istisna olmaqla bütün şairlərə ustadlıq etmək qabiliyyətinə malik olan Seyid Əzim Şirvani bütün insanları Həzrəti-Əlinin (ə) ətəyindən yapışmağa (yəni İmam Əlinin (ə) vilayətini qəbul etmək) və Peyğəmbərin (s) sadiq səhabələrindən olan Salman və Əbuzərin yolunu davam etdirməyi tövsiyyə edir:

*Tut könül ali-Əli damənini, eyləmə qəm,*
*Get bu yoldan ki, bu yol Buzərü Səlman yoludur...*

Bu tarixi hadisədə camaat, xüsusilə Əbu Bəkr və Ömər tərəfindən Əliyə (ə) deyilən təbriklər Həzrətin xilafət məqamına nail olmasını bir daha təsdiqləyir. Çünki ümumi şəkildə bütün müsəlmanlara dostluq məsələsinin elan olunmasında təbrikə ehtiyac duyulmur. Əhmədin "Müsnəd" kitabında yazılır: "Ömər, Peyğəmbərin (s) bəyanatın-

dan sonra Əliyə dedi: "Afərin sənə, ey Əbu Talibin oğlu! Sən hər bir mömin kişi və qadının mövlası oldun."

Fəxri-Razinin "təbliğ" ayəsinin təfsirində yazdığı ifadə də belədir: "Ömər dedi: "Afərin sənə! Sən mənim və bütün mömin kişi və qadınların mövlası oldun!"

Beləliklə, Ömər onu özünün və bütün möminlərin mövlası hesab etdi."

"Tarixi-Bağdad" kitabında Ömərin belə dediyi nəql olunur: "Afərin, afərin olsun sənə, ey Əbu Talibin oğlu! Sən mənim və bütün müsəlmanların mövlası oldun."

"Feyzül-qədir" və "Əs-səvaiq" kitablarında da yazılır ki, bu təbriki Əliyə (ə) həm Əbu Bəkr, həm də Ömər demişdir.

Aydındır ki, möminlər arasındakı sadə dostluğun bəyanı üçün böyük bir mərasim qurulmasına ehtiyac yoxdur. Deməli, hədisdəki "vilayət" sözü xilafətdən başqa bir məna daşıya bilməz.

Öncə qeyd etdiyimiz Həssan ibn Sabitin aydın ifadələrlə zəngin şeiri bizim müddəamıza canlı bir şahiddir.

Qədir-xum hədisini təsdiq edən digər ayələr

"Məaric" surəsinin başlanğıcında buyurulur:

"Bir nəfər vaqe olacaq əzab barədə soruşdu. O əzab kafirlərə məxsusdur və onu dəf edə biləcək bir kimsə yoxdur. O əzab yüksək dərəcələr sahibi olan (mələklərini göylərə qaldıran) Allah tərəfindəndir!"

Bir çox təfsirçilər və hədis raviləri bu ayələrin nazil ol-

ma səbəbi barədə belə demişlər:

İslam peyğəmbəri (s) imam Əlini (ə) “Qədir-Xum”da xəlifəliyə seçib “Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır” buyurandan sonra bu xəbər tez bir zamanda hər tərəfə yayıldı. Münafiqlərdən olan Nöman ibn Haris Fehri Peyğəmbəri-əkrəmin (s) hüzuruna gəlib dedi: “Sən bizə göstəriş verdin ki, Allahın yeganəliyinə, sənin peyğəmbərliyinə şəhadət verək. Biz də şəhadət verdik. Sonra bizə cihad, namaz, həcc və zəkatı əmr etdin. Onları da qəbul etdik. Yenə bunlarla kifayətlənməyib, nəhayət, bu cavanı (Əliyə (ə) işarə etdi) öz yerinə canişin təyin edərək dedin: “Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır!” Bu göstəriş özündəndir, yoxsa Allah-taala tərəfindən?”

Peyğəmbər (s) buyurdu: “Yeganə məbud olan Allaha and olsun ki, Allah tərəfindəndir!”

Bu vaxt Nöman ibn Haris üzünü döndərib dedi: “İlahi! Əgər bu söz haqq və Sənin tərəfindəndirsə, onda bizim başımıza bir daş endir!” Elə bu zaman birdən səmadan bir daş düşüb, onun başını yardı və qeyd etdiyimiz ayələr nazil oldu.

Bu rəvayət “Məcməül-bəyan” kitabında Əbül-Qasim Həskanidən nəql olunmuşdur. Uyğun rəvayəti əhli-sünnə təfsirçiləri də öz kitablarında, o cümlədən, Qurtubi (öz təfsirində), Alusi (“Ruhul-məani” kitabında) və Əbu İshaq Sələbi (öz təfsirində) azacıq fərqlə nəql etmişlər.

Əllamə Əmini “Əl-qədir” kitabında bu rəvayəti otuz nəfər əhli-sünnə alimindən (mənbə və mətnləri ilə birlik-

də), o cümlədən, Hələbinin "Sirə", Həməvinin "Fəraidus-səmteyn", Şeyx Məhəmməd Zərəndinin "Durərus-səmteyn", Şəmsəddin Şafeinin "Əs-siracul-munir", Süyutinin "Şərhu-camiis-səğir", Hafiz Əbu Übeyd Hərəvinin "Təfsiru-ğəribil-Quran" və Əbu Bəkr Nəqqaşın "Təfsiru-şəfais-südur" kitablarından nəql etmişdir.

İmam Əlinin (ə) fəzilətlərini çarəsizlikdən və ikrahla qəbul edən təfsir və hədis alimlərindən bəziləri yuxarıdakı ayələrin nazil olma səbəbinə müxtəlif iradlar tutmuşlar. "Əl-mənar" kitabının müəllifi və digər əhli-sünnə alimləri qeyd etdiyimiz rəvayəti nəql etdikdən sonra belə iradlar irəli sürmüşlər:

Birinci irad: "Məaric" surəsi Məkkədə nazil olmuşdur. Belə isə, "Qədir-Xum" hadisəsi ilə necə uyğun gələ bilər?

Cavab: Bir surənin "məkki" (Məkkədə nazil olan) adlanması o demək deyil ki, onun bütün ayələri Məkkədə nazil olmuşdur. Qurani-kərimin bir sıra surələri məkki adlansa da, onların bəzi ayələri Mədinədə nazil olmuşdur. Eynilə bunun əksinə, "mədəni" (Mədinədə nazil olan) adlanan surələrin də bəzi ayələri Məkkədə nazil olmuşdur. Buna "məkki" adlanan "Ənkəbut" surəsini misal göstərmək olar. Halbuki Təbəri, Qurtubi və digər alimlərin yazdıqlarına əsasən, bu surənin ilk on ayəsi Mədinədə nazil olmuşdur. Yaxud "Kəhf" surəsi "məkki" adlansa da, Qurtubi və Süyutinin öz kitablarında yazdıqlarına görə, onun ilk yeddi ayəsi Mədinədə nazil olmuşdur. Həmçinin bunun əksi olaraq, "mədəni" adlanan, lakin bəzi ayələri Məkkədə na-

zil olan surələrdən də "Mücadilə" surəsini misal göstərmək olar. Bəzi təfsirçilərin yazdıqlarına əsasən, bu surənin ilk on ayəsi Məkkədə nazil olmuşdur. Bir sözlə, Quranikərimdə bəzi surələr vardır ki, Məkkədə, yaxud Mədinədə nazil olsa da, onların bir neçə ayəsi həmin şəhərdə nazil olmamışdır. "Məaric" surəsi də bu qəbildəndir.

İkinci irad: "Məaric" surəsinin ilk ayələrinin nazil olma səbəbi nəql olunan rəvayətdə göstərilir ki, Haris ibn Nöman "Əbtəh" adlı yerdə Peyğəmbərlə (s) görüşmüşdür. "Əbtəh" Məkkədə bir dərənin adıdır. Bu isə "Qədir-Xum" hadisəsi ilə uyğunlaşmır.

Cavab: Əvvəla, "əbtəh" sözü bütün rəvayətlərdə yox, bəzi rəvayətlərdə nəql olunmuşdur. İkincisi, "əbtəh" və "bətha" sözləri ümumiyyətlə, içərisində çınqıl daşları olan arxlara və qumsal yerlərə deyilir. Mədinədə və başqa məntəqələrdə belə yerlər az deyil. Maraqlıdır ki, ərəb ədəbiyyatında dəfələrlə buna işarə edilmişdir. O cümlədən, Şəhabəddinin Əhli-beytin (ə) şəninə söylədiyi məşhur şeirlərində onların qatilləri ilə bağlı belə deyilir:

*"Mələkna fəkanəl-əfvu minna səciyyətən,*
*Fələmma mələktum, salə bid-dəmi əbtəhu,*
*Və hələltumu qətləl-usari və taləma,*
*Ğədəvna ənil-əsra nəfu və nəsfuhu."*
*"Qurduğumuz dövlətdə səciyyəmiz əfv idi*
*Sizsə hakim olandan, "əbtəh" qan ilə dolmuş!*
*Siz hətta keçmədiniz əsirlərin qanından,*
*Bizimsə güzəştimiz könüllərdə yer almış!"*

Aydındır ki, Peyğəmbərin (s) Əhli-beytinin əksər övladları İraq, Kərbəla, Kufə və Mədinədə qətlə yetirilmişdir və Məkkədə yerləşən “Əbtəh” adlı məntəqədə qan tökülməmişdir. Bəli, Məkkədən təxminən, on fərsəx aralı yerləşən “Fəxx” məntəqəsində də şəhadətə yetənlər olmuşdur. Lakin “Əbtəh” məntəqəsi Məkkənin lap yaxınlığındadır.

Şairlərdən başqa birisi şəhidlərin sərvəri imam Hüseyni (ə) bu sayaq mədh edir:

*Və təinnu nəfsi lər-rübui və qəd ğəda,*
*Bəytun-nəbiyyi muqəttəul-ətnabi,*
*Bəytun li-alil-Mustəva fi Kərbəla,*
*Zərbuhu bəynə əbatihin və rəvabi.*

“Mənim canım Peyğəmbərin (s) viran edilmiş evlərinin əsər-əlamətindən nalə edir. O cümlədən, Kərbəlada Peyğəmbərin (s) Əhli-beytindən bir ev “əbtəh”lərin və hündür təpələrin arasında bərpa edilmişdi.” (Burada “əbtəh” qumluq yerlər mənasındadır.)

İçərisində “əbtəh”, yaxud “əbatih” ifadələri olan və Məkkədəki müəyyən məntəqəyə aid olmayan şeirlər çoxdur. Bir sözlə, “əbtəh” Məkkədə bir məntəqənin adı olsa da, onun ümumi mənası bir məntəqəyə məxsus deyil.

Bu ayələrin özündən əvvəl və sonrakı ayələrlə əlaqəsi necədir?

Bəzi təfsirçilər “təbliğ” ayəsindəki həqiqətdən yayın-

maq məqsədilə bəhanəyə əl atmış, demişlər ki, bu ayənin əvvəlki və sonrakı hissələri "kitab əhli" barəsində söz açdığından, onun imamət, vilayət və xilafət məsələsilə heç bir uyğunluğu yoxdur. Belə bir fərq qoyulması isə Qurani-kərimin bəlağət və fəsahətinə ziddir.

Quran ayələrinin toplanması ilə tanış olanlar yaxşı bilirlər ki, ayələr tədricən və müxtəlif münasibətlərlə nazil olmuşdur. Buna görə də çox vaxt surələrdə müxtəlif mövzulardan söz açılır. Məsələn, eyni bir surədə həm müəyyən bir müharibədən, həm İslamın hökmlərindən, həm münafiqlərdən, həm də möminlərdən danışılır. "Nur" surəsinə diqqət yetirsək, tövhid, məad, zinanın hökmü, "ifk" hadisəsi, münafiqlər, hicab və digər məsələlərə işarə edildiyinə şahid olacağıq (Quranın digər böyük surələri də az-çox bu qəbildəndir). Hərçənd, bir surənin məcmusu arasında ümumi bağlılıq həmişə qorunur.

Bir surənin məzmunca müxtəlifliyi Qurani-kərimin tədricən və zərurəti nəzərə almaqla, müxtəlif münasibətlərdə nazil olması ilə əlaqəlidir. Qurani-kərim əvvəlcədən təyin olunan bir mövzu haqqında danışan klassik kitab deyil. Buna əsasən, "Maidə" surəsinin bir hissəsinin "kitab əhli", digər bir hissəsinin isə "Qədir-Xum" hadisəsindən söz açmasında heç bir anlaşılmazlıq yoxdur. Əlbəttə, ümumi götürsək, bu mövzular arasında da müəyyən bağlılıq var. Peyğəmbərin (s) yerinə canişin təyin edilməsinin də "kitab əhli"nə təsiri vardır, çünki onlar Peyğəmbərin (s) vəfatından sonra İslamın dağılacağına ümidvar idilər.

## Nə üçün Əli (ə) Qədir-Xum hədisinə istinad etmədi

Bəziləri bəhanə axtarıb deyirlər ki, əgər əzəmətlə yad edilən "Qədir-Xum" hədisi həqiqətdirsə, nə üçün Əli (ə), onun Əhli-beyti və dostları zəruri hallarda ona istinad etmirdilər? Onların Əlinin (ə) xilafətini sübut etmək üçün bu mühüm sənədə əsaslanmaları daha yaxşı olmazdımı?

Bu irad da digər iradlar kimi təfsir, tarix və hədis kitablarından məlumatsızlıqdan irəli gəlmişdir. Çünki əhli-sünnə alimlərinin bir çox kitablarında nəql olunmuşdur ki, Əli (ə) özü, Əhli-beyt imamları, eləcə də onların dostları "Qədir-Xum" hədisinə istinad etmişlər. Maraqlıdır ki, irad tutanlar bunları necə görməmişlər?

Xətib Xarəzmi Hənəfi "Mənaqib" kitabında Amir ibn Vasilədən nəql edir ki, (Ömərdən sonra xəlifə təyin etmək üçün altı nəfərdən ibarət) Şura günü Əli (ə) ilə birlikdə idim. O, şura üzvlərinə belə deyirdi: "Sizə tutarlı bir dəlil göstərirəm ki, ərəb və əcəm onu dəyişməyə qadir deyil… Sizi Allaha and verirəm! Sizin aranızda elə bir kəs varmı ki, Peyğəmbər (s) onun barəsində belə buyurmuş olsun: "Mən hər kəsin mövlasıyamsa, Əli də onun mövlasıdır. İlahi! Onun dostunu Sən də dost bil, onu sevəni Sən də sev. Hazır olanlar bunu qaib olanlara çatdırsınlar!"

Hamı dedi: "Xeyr!"

Bu rəvayəti Həməvi "Fəraidus-səmteyn" kitabının 58-ci bölümündə, İbn Hatəm "Durrun-nəzim" kitabında və İbn Əbil-Hədid "Nəhcül-bəlağə"nin şərhində, eləcə də İbn Hə-

cər "Əs-səvaiq" kitabında Darü-Qutnidən nəql etmişlər.

"Əl-qədir" kitabında İmam Əlinin (ə) müxtəlif vaxtlarda, o cümlədən, Osmanın xilafəti və öz xilafəti dövründə, Cəməl müharibəsində və Kufədə Siffeyn müharibəsi günü Qədir-Xum hədisinə əsaslanmasına geniş yer verilmişdir. Bundan əlavə, Fatimeyi-Zəhra (ə.s), imam Həsən (ə), İmam Hüseyn (ə), bir qrup səhabə və qeyri-səhabələrin də on altı yerdə bu hədisə istinad etmələrini nəql etmişdir. Bu da müəllifin geniş məlumatından və bu hədisin müxtəlif zamanlarda diqqət mərkəzində olmasından danışır. Hərçənd, hər dövrdə mövcud siyasətə uyğun olaraq bunu əhəmiyyətsiz qələmə verməyə çalışmışlar. Bu bəhsin əhatəsi geniş olduğundan deyilənlərlə kifayətlənirik.

Seyyid Əzim Şirvaninin aşağıdakı Ğədir-Xum barədə olan müxəmməsi bir-çox kitablarda verilsə də, indiyədək geniş şərh edilməmişdir. Biz bu kitabda bu müxəmməsi imkan daxilində ətraflı izahlarla əziz oxucuların diqqətinə yetirmək istəyirik:

*Saqi, mey ver bizə kim, dövlət olub yar bu gün,*
*Şövqdən cünbüş edir sabitü səyyar bu gün.*
*Dövr edər vəcd ilə nöh gümbədi-dəvvar bu gün,*
*Mən gərək nuş qılam badeyi- gülnar bu gün,*
*Badə içməkdə mənim bir qərəzim var bu gün.*

(Bu gün bizə səadət üz verdiyinə görə saqi, səndə bizə mey ver. Tərpənməz və dövr edən planetlər bu səadətin bəxş etdiyi eşqə görə şadlıq (bayram) içərisindədir. Doq-

quz dövr edən göy qübbəsi bu gün sufi kimi vəcdə gələrək səma rəqsi oynayar. Odur ki, bu gün gül rəngli şərab içmək mənə vacib olmuşdur. Ancaq mən şərab dolu bu qədəhi boş-boşuna yox, böyük bir məqsədlə içirəm).

*Etmişəm tövbə əgər badəvü tərsadən mən,*
*Keçmişəm deyrü kinişt ilə kəlisadən mən.*
*İçmişəm badeyi-rəngin xümi-İsadən mən,*
*Almışam indi xəbər badeyi-Mövladən mən,*
*Meyi-Mövladən elə sağəri sərşar bu gün.*

(Əgər mən xiristianlıq şərabından tövbə etmişəmsə, deməli, xiristianlıqla bağlı hər şeydən keçmişəm. Mən yalnız İsa peyğəmbərin (ə) xüsusi şərabla dolu küpündən mey nuş etmişəm. Bu isə məni Həzrəti-Əli (ə) şərabından xəbərdar etmişdir. Odur ki, ey saqi, sən gəl bu gün bizə ancaq odlu Həzrəti-Əli (ə) şərabından ver).

*Badeyi-Mustəfəvi Xümdə edər cuşü xuruş,*
*Ki, səfasından onun qarət olur taqətü huş.*
*Badədir ruhi-Xuda, saqiyi-gülçöhrə Süruş,*
*Aləmə nəşri-maarif eləyir badəfüruş,*
*Açılıb rəhmət ilə xaneyi-Xəmmar bu gün.*

(Peyğəmbərlik şərabi (qədəhi) Qədir-xumda aşıb-daşar, bu aşıb daşma insanların huşunu başından alar, bu şərab ilahi ruh, gül üzlü saqi isə şadlıq təzahürüdür. Badə satan bu şə-

rabla dünyanı maarifləndirir bütün bunlara görə bugün Allahın rəhməti ilə meyxanə evinin qapısı taybatay aşılmışdır).

*Piri-meyxanə meyi-nabə işarət eylər,*
*Dürdnuşani-vilayətə bəşarət eylər.*
*Dini təkmil qılıb kəşfi-kəramət eylər,*
*Müxtəsər, aləmə təbliği-risalət eylər,*
*Faş olur mərtəbeyi-Heydəri-Kərrar bu gün.*

(Meyxanənin piri təptəzə şərabı nişan verər, qədəhin işərisində qalmış mey xıltı Həzrəti-Əlinin (ə) vilayətini müjdələyir (muştuluqlayır). Bununla da dini mükəmməlləşdirərək özünün bütün gözəlliklərini açıb göstərər. Sözün qısası o öz Peyğəmbərliyini bütün dünyaya elan edər. Həzrəti-Əlinin (ə) uca dərəcəsi bugün bütünlüklə ortaya çıxır). Seyyid Əzim burada nazil olan digər bir ayəyə işarə edir.

Sonra Peyğəmbər (s) buyurdu: "Bilin ki, sizin vəzifəniz bu hadisəni burada olmayanlara da çatdırmaqdır." Peyğəmbərin (s) xütbəsi sona çatdı. Camaat tər içində idi. Camaat dağılışmamış Cəbrail (ə) nazil olub, "Maidə" surəsinin 3-cü ayəsini gətirdi: "Bu gün sizin üçün dininizi kamil etdim, nemətimi tamamladım və bir din olaraq İslamı bəyəndim." Bu ayədəki nemətdən məqsəd İmamətdir. Axund Hacı Soltan "Əlidir" rədifli qəzəlində bu nemətə işarə edərək yazır:

*Çatdı bu ayə Əli şəninə, "Əkməltu Ləkum",*
*Çün ki hər ayəvü hər surəvü hər cüz Əlidir.*

Bu ayə nazil olduqdan sonra Peyğəmbər (s) təkbir ("Allahu Əkbər") deyib, öz sözünə davam verdi: "Allah böyükdür. O Allah ki öz dinini kamil etdi, öz nemətini tamamladı, mənim risalətimdən və məndən sonra Əlinin (ə) rəhbərliyindən razı qaldı". Şair Fəxrəddin Cəfakeş Peyğəmbərin (s) bu şükrünü belə vəsf edir:

*Biz ki, Quranda bu "Əkmәltə" kəlamın oxuruq,*
*Nə bu Davuda, nə Musaya, nə İsaya gəlib.*

Peyğəmbərin (s) ən mühüm vəzifələrindən biri də imamət məqamını camaata çatdırmaq və Əlinin (ə) özündən sonra rəhbər olmasını elan etmək idi.

*Mən də peyğəmbəri-namursəliyəm Şirvanın*
*Ki gərək zahir edəm şə'nini hər zişanin.*
*Faş edəm rəmzini həqdən yetişən fərmanın,*
*Saqiya, yoxmu əyağında meyi-rummanın,*
*Şəhri qıl badə ilə cənnəti-ənhar bu gün.*

(Mən isə Şirvanın tanınmayan, bilinməyən bir şeir peyğəmbəriyəm. Ona görə də hər bir hörmətli şəxsin gizli qalmış şan-şöhrətini üzə çıxarmaq mənə vacibdir və Allahtəaladan gələn hər bir hökmün gizli sirlərini açıqlayaraq ortaya qoyam. Ey saqi, məgər sənin qədəhində qırmızı şərab yoxdurmu ki, gətirəcəyin qədəhlə altından su arxları axan Cənnət bağlarını bizə göstərəsən).

*Həqq edib çün məni peyğəmbəri-fövci-şüəra,*
*Mən gərək aləmə təbliğ qılam sübhü məsa.*
*Ərşdən Həq mənə təbliğə qılır faşi-nida*
*Ki, əgər eyləməsən xəlqə bu təbliği əda,*
*Olmayıb xəlqə risalət dəxi izhar bu gün.*

(Allah-təala məni bütün şairlərin peyğəmbəri seçdiyindən, səhər-axşam, gecə-gündüz Həzrəti-Əli (ə) və on bir övladının həqiqətini bütün dünyaya təbliğ edəm. Axı, Allah-təala hər gün öz ərşindən bu həqiqəti təbliğ etməyin zəruriliyini açıq-aşkar buyurur. Həmin buyruq belədir: "Ey Seyyid Əzim Şirvani! Əgər sən bu təbliğdən irəli gələn vəzifələri yerinə yetirməsən, elə bil ki, sənə bəxş etdiyim şeir peyğəmbərliyinin öhdəsindən gələ bilməmisən, sənə verdiyim ilhamı Haqq yolunda lazımınca işlətməyi bacarmamısan).

*Mən rəsuli-şüəra, mülki-vəfadən gəlirəm,*
*Hüd-hüdi-naməbərəm, şəhri-Səbadən gəlirəm.*
*Aləmə sibqət edib badi-səbadən gəlirəm,*
*Həcci-mə'nayə gedib, kuhi-Minadən gəlirəm,*
*Şahidi-vəhdət olub kəsrəti-zəvvar bu gün.*

(Şairlərin peyğəmbəri olan mən vəfa mülkündən gəlirəm. Süleyman peyğəmbərə (ə) xəbər gətirən adlı-sanlı Hüd-hüd quşuyam, Səba şəhərindən gəlirəm. Süleyman peyğəmbər (ə) lütf edərək ixtiyarındakı küləyi müvəqqəti olaraq mənə verdiyinə görə, mən bütün şairləri geridə qo-

yaraq, onların hamısını ötmüşəm və səba yelinin üzərində aləmi-Lahudtdan aləmi-Nasuta doğru qayıdıram. Odur ki, mənim etdiyim Həcc ibadəti zahirən Mina dağından başlasa da, əslində sırf batini bir Həccdir.

*Kəbəyə Əhli-Həqqin batini dildəndi yolu,*
*Qeyri yol getsən əgər, quli-biyaban yoludur!*

Beləliklə, aydın olur ki, bu gün çoxluq təşkil edən böyük zəvvar kütləsi tayı-bərabəri olmayan və misli görünməyən bir vəhdətə şahid olmuşdur).

*Axıri-Həccini çün Xətmi-Rəsul etdi təmam,*
*Azimi-Yəsrib olub Əhmədi-Məhmud məqam.*
*Ol şəhə Xummi-Ğədir üzrə olundu ilham,*
*Gəldi Cibril ki, ey sərvəri-səyyarəməqam,*
*Sənə göndərdi salam İyzədi-Qəhhar bu gün.*

(Sonuncu Peyğəmbər (s) özünün sonuncu həccini bitirdikdən sonra Yəsrib (Mədinə)şəhərinə doğru hərəkət etdi,

Qədir-xumma çatdıqda belə bir vəhy gəldi ki; Cəbrail (ə) gəlib xəbər yetirdi ki, sən ey planetlərin başının tacı olan peyğəmbər (s) qəhri böyük əzəmətli Allah-təala sənə bugün salam göndərdi).

*Sən gərəkdir, edəsən Xummi-Qədir üzrə nüzul,*

*Goftgu eyləməsin zümreyi-əshab füzul.*
*Bəs, gərək zahir ola mərtəbeyi-zövci-Bətul,*
*Olacaqdır o şəhin ziddi "zəlumən və cəhul"*
*Açılır aləmə məxfi olan əsrar bu gün.*

(Sən gərək Qədir-Xum deyilən yerdə ayaq saxlayıb dayanasan. Artıq-əskik danışanların sözbazlıq etməsinə imkan verməyəsən, çünki Həzrəti-Əlinin uca məqamı məhz bugün üzə çıxmalıdır. Onun əleyhinə gedənlər zalimlər və cahillər sırasına düşəcəkdir. Bugün bütün gizli sirlərin üzərindən örtük götürülür).

*Yetir afaqə o şahənşəhin övlalığını,*
*Sabit et cümlə bu mövlalərə mövlalığını.*
*Əlivü ali-Əli gövhəri-əlalığını,*
*Zatının dürri-giranmayeyi-valalığını,*
*Minbər üstə çıxıban eyləgilən car bu gün.*

(Sən Həzrəti-Əlinin (ə) övliyalığını (üstünlüyünü, fəzilətini)göyün son üfüqlərinə qədər çatdır. Onun həqiqi rəhbər olmasını özünü rəhbər sayan hər bir kəsə bildir Əli (ə) və Əlinin (ə) nəsli özünün yüksək inci olmasını zat etibarilə yüksək və olduqca bahalı mənbədən başlanğıc götürməsini bugün minbər üzərinə çıxaraq dünyaya car çək).

*Etdi çün hökm nüzul ol şəhi-səyyarəxidəm,*
*Oldu əshablərin surəti-hali dərhəm.*
*Etdilər ərz ki, ey zübdeyi-əhli-aləm,*

*Su tapılmaz bu Ğədir içrə hərarətdən həm,*
*Kürreyi-xak olubdur küreyi-nar bu gün.*

(Peyğəmbər (s) Ğədir-xumda dayanmağı buyurduqda səhabələrin sifətində narahatçılıq yarandı və onlar dedilər ki, ey kainatın bəzəyi olan Rəsulullah (s) Ğədir-xum adlanan bu yer çox isti olduğundan burada su tapmaq qeyri mümkündür. Axı, bu istinin şiddətindən bugün yer kürəsi alov kürəsinə çevrilmişdir).

*Nazil olmağə deyil hiç münasib bu məqam,*
*Hökm hökmündü, vəli biz sənə etdik elam.*
*Açıban dürci-dəhən sərvəri-e'cazkəlam,*
*Dedi: Bu hökmi-Xudavənddir, ey qövmi-giram,*
*Eyləyib hökm mənə Qadiri-Cəbbar bu gün.*

(Səhabələr dedilər ki, bu məntəqə düşərgə salmaq üçün qətiyyən əlverişli deyildir. Sənin buyruğun bizim üçün qanundur, lakin biz də öz fikrimizi açıb sənə bildiririk. Peyğəmbər (s) mübarək ağzını açaraq buyurdu ki; "Ey mənim istəkli ümmətim, bu Allah-təalanın hökmüdür. Hər cür qüdrətə malik olan Allah-təala bu hökmü mənə bugün bəyan etməyi tapşırmışdır).

*Etdi əshabə bu hökmü çu şəhi-ərşsərir,*
*Dedilər sövt ilə "ləbbeyk" ucaldı təkbir.*
*Oldular cümlə piyadə çi səğirü çi kəbir,*

*Müntəzir kim, nədi fərmani-Xudavəndi-Qədir,*
*Nə büruz eyləyəcək İyzədi-Dadar bu gün.*

(Sanki ərş taxtının üzərinə çıxmış Peyğəmbər (s) bu hökmü səhabələrə bəyan etdi, onlar yüksək səslə "ləbbeyk" dedilər və "təkbir" sədası göyə ucaldı. Böyüklü-kiçikli "səhabələrin" hamısı atlarından düşdülər və qədirqiymətli Allahın buyruğunun nə olduğunu gözləməyə başladılar. Onlar hamsı dövranı dövr etdirən Allahın hansı hadisəni göstərəcəyini gözləyirdilər).

*Ol Şahənşahə hicazi-şütür oldu mənbər,*
*Bədi-təmhidi-xudavəndi-qədimü davər,*
*Dedi: Aya, deyiləm mən sizə candan behtər?*
*Dedilər cümlə: Bəli, ey şəhi-valagövhər,*
*Sənsən övlalığa Mövlayi-səzavər bu gün.*

(Böyük olan Allahın izni ilə o Hicaz şahı yəni Rəsulullah (s) üçün dəvə yəhərlərindən iri bir minbər düzəltdilər o səhabələrdən soruşdu ki: "Məgər mən sizə öz canlarınızdan da əziz deyiləmmi?!" Səhabələrin hamısı bir ağızdan dedilər: "Ey şan-şöhrəti uca olan Peyğəmbər (s), belədir, bu gün ən uca rəhbər məqamı yalnız sənə məxsusdur).

*Dedi:"Hər şəxsə ki, aləmdə mən olsam mövla,*
*Ona mövladi Əli, ol şəhi-mülki-məna.*
*Ona nasir olana nasir ola bari-Xuda,*
*Hasidü düşməninə düşmən ola Rəbbi-səma".*

*Bu duanı elədi Əhmədi-Muxtar bu gün.*

(Rəsulullah (s) belə buyurdu: "Dünyada mən kimin rəhbəriyəmsə, mənа mülkünün şahı olan Əli də (ə) onun rəhbəridir. Ona kömək edənə Allah da kömək etsin, ona düşmənçilik edənlə isə uca göyün Rəbbi özü düşmən olsun!"- Həzrəti-Mühəmməd (s) Ğədir-Xum günündə məhz belə dua etmişdir).

İmamiyyə alimlərinin təfsirinə görə, Əşrəfi-Məxluqat (Peyğəmbər (s) Vida həccindən qayıdıb Qədir-Xuma yetişəndə bir xütbə oxuyub buyurdu ki: "Allahın əmri ilə Əli ibn Əbu Talibi (ə) özümə varis və canişin etdim. Bütün əshabəyə də əmr etdi ki, Əliyə (ə) beyət etsinlər. Əksər rəvayətlərə görə, Həzrəti-Peyğəmbər (s) Əlinin (ə) əlindən yapışıb o qədər qaldırdı ki, qolunun altı göründü və buyurdu: "Allahım, onu dost biləni Sən dost bil və düşmən biləni düşmən bil"[1].

---

[1] Mövlazadə, "Kitabül-Bəyan", cild 1, səh. 213

## "MÖVLA" SÖZÜNÜN TƏHLİLİ

İndi isə "Mövla" sözünün şərhinə keçək. Bunun üçün M.Asim Köksal əfəndinin "İslam tarixi" əsərinə diqqət yetirək. Burada "Mövla" sözü tam 22 (iyirmi iki) mənada verilir.[1] Və sonra da müəllif buna mənbə kimi Firuzabadinin "Qamusul-Muhit" kitabını göstərir. Firuzabadi "Mövla" sözünün mənaları ilə bağlı deyir ki, "mövla"nın mənasını "Malik", "Qul azad edən", "Azad edilmiş qul", "Sahib", "Əmioğlu", "Qonşu", "Oğul", "Əmi", "Şərik", "Dost", "Qız qohumu", "Yeznə" və s. kimi başa düşmək olar.

Əziz müsəlman qardaşlar! Kimin "mövla" sözü üçün hansı mənanı əsas seçməsinə baxmayaraq, Həzrəti-Peyğəmbərimiz (s) hansı mənada söyləyibsə, biz o mənada da götürüb tərcümə edirik.

Yəqin, düşünəcəksiniz ki, hansı mənada qəbul etdik. Allah yanında hansı mənada qəbul edilmişdirsə, Həzrəti-Peyğəmbər (s) necə buyurmuşdursa ("Mən kimin mövlasıyam, Əli (ə) də onun mövlasıdır"), eləcə də qəbul edirik. Madam ki, Həzrəti-Peyğəmbər (s) hər bir müsəlmanın vəlisidir, onda Həzrəti-Əli (ə) də müsəlmanların vəlisidir.

Cənab professor əlavə olaraq, "…Həzrəti-Əlini (ə) sev-

---

[1] M.Asim, "İslam tarixi", cild 10, səh. 314

mək Həzrəti-Peyğəmbəri (s) sevmək kimi fərz, ona düşmən olmaq Həzrəti-Peyğəmbərə (s) düşmən olmaq kimi haramdır. Bu Əhli-sünnənin əqidəsidir” deyə bəyan edir.

Çox gözəl bir fikirdir, Həzrəti-Əlini (ə) sevmək Həzrəti-Peyğəmbəri (s) sevmək kimi fərzdir, onda Həzrəti-Peyğəmbərin (s) “Mən elmin şəhəriyəm, Əli (ə) onun qapısıdır” deməsini də nəzərə alsaq, görərik ki, biz Həzrəti-Əlini (ə), ümumiyyətlə, Əhli-beyti (s) seviriksə, onda gərək onların elmindən də faydalanaq.

Biz bilirik ki, Həzrəti-Peyğəmbər (s) cənablarından sonra Həzrəti-Əli (ə) hər bir xüsusiyyətdə, o cümlədən, elmdə də hamıdan yüksəkdə idi. Onu da bilirik ki, Həzrəti-Əlinin (ə) övladlarından olan İmam Cəfəri-Sadiq (ə) böyük alim olmuşdur. Hətta bu gün sünni məzhəb qardaşlarımızın özlərinə rəhbər kimi seçdikləri İmam Əbu Hənifə və İmam Malik İmam Cəfəri-Sadiqdən (ə) iki il dərs almışdılar.

İmam Cəfəri-Sadiqin (ə) məktəbində 4000 şəxs dərs almışdır. Onun Peyğəmbərdən (s) söylədiyi hədisləri 4 min nəfər rəvayət etmişdir.

Biz də Peyğəmbər (s) Əhli-beytinin (ə) elmindən özünün buyurduğu əmrə görə faydalanmalıyıq. Əgər biz müsəlmanlar “Elm şəhərin”ə qapıdan girsək, o şəhər sahibinin bizi qarşılamasına şübhə etmək olmaz. Yox, əgər qapını qoyub divardan atılsaq, qanunu pozduğumuza görə bizə cəza verərlər.

Ancaq Prof. Dr. Əthəm Ruhi Ficlal kimi bəzi araşdırıcılar başqa bir şübhəni ortaya atıb deyirlər ki, Qə-

dir-Xum hadisəsi baş vermişdir, amma Peyğəmbərin (s) "Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır" kəlamı şiələrin düşündüyü kimi, xilafət və vilayət mənasında deyildir, dost və köməkçi mənasındadır".

Sual olunur, görəsən, "Əli sizin dostunuz, yaxud da vəlinizdir" sözlərini bəyan etmək üçün qızmar səhrada, yandırıb-yaxıcı havada 120 min hacını bir yerə toplayıb Həzrəti-Əlini (ə) vəli seçərək, əlini qaldırmaq, habelə təbrik (başda Ömər ibn Xəttab olmaqla) və beyət etmək kimə və nəyə görə idi? Həzrəti-Peyğəmbər (s) bu qədər böyük bir işi əbəs yerə edirdimi?

Əlbəttə, yox! Necə ki, Qurani-Kərimdə buyurulur: "Düşünün, ey ağıl sahibləri, ola bilsin ki, (fikirləşib düzgün yol ilə getdiyiniz üçün) sizə (qiyamətdə) rəhm oluna!"

Bəhlul Behcət əfəndi ləqəbi ilə məşhur olan mərhum Qazi Məhəmməd Türkiyədə tanınmış alimlərdən biri olmuşdur. Ulu babası da məşhur qazi olmuşdur. Özünün dediyinə görə, əsil-nəsəbi məhşur səhabə Əbu Əyyub Ənsariyə gedib çıxır. Ona atası Qazi Məhəmməd, habelə İstanbul Şeyxulislamı Seyyid Əbdül Mehdi Səyyadi Rüfan hədisdə rəvayət icazəsi vermişdi, "Sihahus-Sittə" (altı kitab, yəni sünni məzhəbinin Qurandan sonra düzgün və hər bir hədisini sözsüz qəbul etdiyi məşhur kitablar) və başqa kitablarını onun icazəsi ilə nəql edirdi.

Mərhum Bəhlul Behcət əfəndi əvvəlcə Hənəfi məzhəbində olmuş, sonralar Hənəfi məzhəbini tərk edərək, Şafei məzhəbini qəbul etmiş və ömrünün axırına kimi bu məzhəbdə qalmışdır. Bəhlul əfəndi bir çox kitabların müəllifi-

dir. O, 1912-ci ildə Zəngəzurda anadan olmuşdur. Səbahəddin Eloğlu "Zəngəzur hadisələri" adlı kitabında Bəhlul Behcət əfəndi haqqında belə məlumat verir: "Qazi Bəhlul Behcət Zəngəzurda yaşamışdır. O, erməni daşnaklarının azərbaycanlılara qarşı başladıqları soyqırımı zamanı əhali arasında böyük ideoloji iş apararaq şiə və sünni məzhəblərini birləşdirə bilmişdir. Əhali arasında hörmət əlaməti olaraq Bəhlul əfəndi kimi tanınan Bəhlul Behcət Zəngəzur əhalisindən ordu yaradıb ermənilərə qarşı böyük əzmlə vuruşmuş və böyük qələbələrə nail olmuşdur. Aprel çevrilişindən sonra Bəhlul Behcət bir müddət Zəngəzurda yaşamış, repressiya dövründə xalqımızın bir çox ləyaqətli oğulları kimi, o da həbs olunmuşdur. Bəhlul Behcət 10 il Bakıda Bayıl həbsxanasında qaldıqdan sonra, ermənilərin fətvası ilə gizli şəkildə öldürülmüşdür". Allah haqq yolunda şəhid olanlara rəhmət eləsin!

Mərhum əfəndi "Təşrih və mühakimə" ("Ali-Məhəmməd (s) tarixində") adlı dəyərli bir əsər yazmışdır. O, Vida həcci zamanı Qədir-Xumda baş vermiş həqiqət haqqında öz sözünü demiş və Qədir-Xum hadisəsini söyləyən səhabələrin adlarını belə zikr etmişdir:

"Qədir-Xum hədisini həmin gün Allahın Rəsulundan (s) eşidib təsdiq edən səhabələr bunlardır: Hüzeymə bin Sabit, Səhl bin Səd, Ədi bin Hatəm, Üqbə bin Amir, Əbu Əyyub əl-Ənsari, Əbu Yəla əl-Ənsari, Sabit bin Vədiyətul Ənsari, Əbu Fəzalətul-Ənsari, Əbdürrəhman bin Əbdu Rəb, Cüneydə bin Cündə, Zeyd bin Ərqəm, Zeyd bin Şə-

racil, Cabir bin Abdulla, Abdulla bin Abbas, Əbu Səid əl-Xudri, Əbuzər, Cübeyr bin Mütəm, Hüzeyfə bin Yəmən, Hüzeyfə bin Üseyd və Səlman əl-Farsi (Allahın salamı və rəhməti onlara olsun). Bu səhabələrin Ğədir-Xum hədisini rəvayət etmələri Əllamə Əsərəddin "Üsdul-Qabə" əsərinin III cildinin 307-ci səhifəsində, eyni cildin 321-ci səhifəsində, yenə həmin əsərin I cildinin 308-ci səhifəsində və kitabın VIII cildinin 283-cü səhifəsində, yenə həmin kitabın III cildinin 274-cü səhifəsində və "Siratəl-Höləbiyyə" (müəllifi Nuriddin Əli Hələbi, 1044-cü hicri ili) və "Yənabiul-məvəddət" kitabının 40-cı səhifəsində, habelə "Səvaiqul-Muhriqə" və "Səhihi-Müslüm" əsərlərində və Nəsai Tirmizinin, İbn Macənin, Əhməd bin Hənbəlinin, Hakimin və başqa müəlliflərin kitablarında öz təsdiqini tapmışdır."

Mərhum qazi bu hədis haqqında bir izahat da verir ki, "…Rəsulullah Allahdan icazəsiz heç bir əmri icra etməz… bu əmri Allah hökmü ilə etmişdir… O şeydə ki, Allahın Rəsulu (s) ümmətin vəlisidir, həmin şeydə Əli (ə) də ümmətin vəlisidir."[1]

Məhəmməd Həsən Mövlazadə Şəkəvi "Bu ayənin (yəni, "Maidə" surəsi, ayə: 67) nazil olması ilə əlaqədar islam alimləri arasında ixtilaf vardır. Bütün İmamiyyə (yəni, şiə) alimləri və Əhli-sünnə alimlərinin bəzisi buyurublar ki, həmin ayə Əli İbn Əbu Talib haqqında nazil olub".

*Tutdu bir xeymədə bəs Heydəri-Kərrar qərar,*

---

[1] "Təşrih və mühakimə" – Ali-Məhəmməd (s) tarixində, səh. 65-67

*Təhniyyət etdilər ol şirdilə xürdü kibar.*
*İbn-Xəttab xitab eylədi: "Ey şirşikar,*
*"Bəxxi bəxxin ləkə", Mövla səni qıldı Cəbbar,*
*Oldun, ey sərvəri din, aləmə sərdar bu gün".*

(Həzrəti-Əli (ə) özü üçün ayrılmış bir xeymədə əyləşmişdi, səhabələrin hamısı böyüklü-kiçikli o könül ərini təbrik etdilər. Ömər ibni-Xəttab Həzrəti-Əliyə (ə) yaxınlaşaraq ona belə dedi: "Ey şir ovçusu "mübarək olsun, mübarək olsun! İslam rəhbəri artıq sənsən. Allah-təala bu şərəfi yalnız sənə layiq gördü. Sən, ey din rəhbəri, bu gün dünya hökmüranlığı sənə tapşırıldı).

"Təfsiri-Kəbir"də yazılıb: "Bu ayə nazil olanda Həzrəti-Peyğəmbər (s) Onun (Əlinin (ə)) əlindən tutub buyurdu: "Mən kimin mövlasıyam, Əli (ə) də onun mövlasıdır. Allahım, Onu sevəni sev, Onu düşmən hesab edəni Sən də düşmən bil. Ömər (s) ona (Əliyə (ə)) yaxınlaşıb dedi: "Mübarək olsun sənə, ey Əbu Talib oğlu! Oldun mənim ağam və bütün mömin kişi və mömin qadınların ağası".

*O qədər keçmədi kim, xətmi-Rəsul etdi vəfat,*
*Zülməti-xakdə məstur olub abi-həyat,*
*Tutdular Xızr təriqindən o qövmi-zülmat,*
*Qıldılar özlərinə həqq ziyafət isbat,*
*Dedilər:"Rehlət edib Seyyidi-Əbrar bu gün".*

(Bu hadisənin üzərindən bir o qədər də keçməmişdir ki,

Həzrəti-Rəulullah (s) vəfat etdi, sanki diriliş suyu torpağın qaranlıqları içərisində gizləndi. Mühamməd (s) ümməti Xızr (ə) kimi qaranlığa qərq oldu. Özlərini islam rəhbərliyinə layiq bilən bəzi şəxslər, vəhyin tamamlanmasını bəhanə edərək bunu bir təntənəli hal olaraq qələmə verməyə çalışdılar və iddia etdilər ki, bugün ən kamil şəxslərin şəxsi dünyasını dəyişmişdir).

*Uydular Əhrimənə, hökmi-Süleyman qaldı,*
*Bir də həqqin bizə göndərdiyi fərman qaldı.*
*Bənd olub zahirinə, batini-Quran qaldı,*
*Kəsdilər suyunu, əfsürdə gülüstan qaldı,*
*Necə kim, indi də zahirdü o asar bu gün.*

(Belələri Əhrimənlə (atəşpərəst) uyub Süleymanı meydanda tək qoydular. Bundan başqa Allahın bizə göndərdiyi fərmana da əməl etmədilər. Səhabələrin çoxu Quranın zahiri ilə maraqlandılar, ancaq batininə diqqət yetirmədilər. Din bağına gələn suyun qabağını kəsdiklərinə görə o bağ qurumağa məhkum oldu, bu hadisənin mənfi nəticələri indidə özünü göstərməkdədir).

*Hiç şək yoxdu ki, əl'an "kəma kan", saqi,*
*Oldu hər əsrdə bu nüktə nümayan, saqi.*
*Bizə həq nayibidir Fazil Şirvani, saqi,*
*Əlivü ali o sibti-Şəhi-Mərdan saqi*
*Ki, onun həqqini qövmü edər inkar bu gün.*

(Ey saqi, heç şübhə yoxdur ki, bu məsələ həmin dövrdə necə olmuşdusa, indi də o cür qalmaqdadır.Hər dövrdə bu məsələ müzakirə mövzusna çevrildi. Fazil Şirvani bizim üçün haqq naibidir. Ey saqi, Məhəmməd (s) ümmətinin böyük əksəriyyətinin bu gün haqqını dandığı Ali-Əli (ə) məfkurəsidir).

*Elmdə tay deyildir o cənaba bir əhəd,*
*Bu Əli mənqəbətin vəsfinə yoxdur sərhəd.*
*Nə qəmi, etsə əgər hasidi-iqbalı həsəd,*
*Hasidin boynuna zəncir olacaq həbli-məsəd,*
*Münkəri rütbəsinin mənzilidir dar bu gün.*

(Həzrəti-Əliyə (ə) elmdə heç kəs bərabər ola bilməz Həzrəti-Əlinin (ə) mətdhinin və tərifinin sonu yoxdur, baxtına paxıl olmaq yazılanlar paxıllıq etsələr, onlar elə öz paxıllıq odlarının bağlandıqları ipdən asılı qalacaqlar, bunun üçün qəm çəkməyə dəyməz. Bu gün inkarçıların qisməti yalnız və yalnız dar ağacına çəkilməkdir).

***

İslam Peyğəmbərinin (s) risalətindən başqa üç böyük məqam və vəzifəsi vardır:

1 – İmamət, yəni zahiri rəhbərlik;
2 – İslam maarifinin yayılması;
3 – Vilayət, yəni mənəvi rəhbərlik.

İmamət haqqında Quran buyurub: “Özünüzdən olan əmr sahiblərinə itaət etməniz vacibdir.” Sübut olundu ki,

onlar məsum olmalıdırlar. Yoxsa, qeyri-məsuma qeyri-şərtsiz itaət heç vaxt Allah-təalanın əmri ola bilməz.

İslam maarifinin yayılması ilk növbədə Əhli-beytin (ə) vəzifəsidir ki, Qurani-Kərim o evdə nazil olub və Peyğəmbərimiz (s) dəfələrlə o dörd nəfəri (əmisi oğlu Əli ibn Əbu Talibi (ə), qızı Xanım Fatimeyi-Zəhranı (s.ə), nəvələri İmam Həsəni (ə) və İmam Hüseyni (ə)) bir yerdə toplayıb və ümmətinə Allah-təalanı şahid tutub ki, bunlardır mənim Əhli-beytim (ə).

Vilayətə gəlincə, Peyğəmbərdən (s) sonra Allah-təala tərəfindən təyin olunan vəlilərdir ki, etiqadımız bunadır: Vilayət məqamında hamısı eyni səviyyədə vilayətə malikdir. Hamısı vahid bir nur və işıqdan işıqlanaraq Allah-təalanın nurunu "güzgü" kimi Vilayət əhlinə qaytarırlar. Onların müqəddəs adları belədir:

1. Həzrəti-Əli ibn Əbu Talib (əleyhissəlam)
2. Həzrəti-Həsən ibn Əli (əleyhissəlam)
3. Həzrəti-Hüseyn ibn Əli (əleyhissəlam)
4. Həzrəti-Əli ibn Hüseyn (əleyhissəlam)
5. Həzrəti-Məhəmməd ibn Əli (əleyhissəlam)
6. Həzrəti-Cəfər ibn Məhəmməd (əleyhissəlam)
7. Həzrəti-Musa ibn Cəfər (əleyhissəlam)
8. Həzrəti-Əli ibn Musa (əleyhissəlam)
9. Həzrəti-Məhəmməd ibn Əli (əleyhissəlam)
10. Həzrəti-Əli ibn Məhəmməd (əleyhissəlam)
11. Həzrəti-Həsən ibn Əli (əleyhissəlam)
12. Həzrəti-Mehdi Sahib-əzzaman (əccələllahu fərəcəhum).

Quran nəzərindən ilahi imamət məqamı yuxarıda qeyd olunan iki məqamdan tamamilə fərqlənir. O, bəşər cəmiyyətlərinə rəhbərlik və onların işlərinə nəzarət etmək kimi daha geniş ixtiyarlara malikdir. Quran ayələrinə istinad edərək bu məsələ ilə əlaqədar aşkar dəlillərimizi nəzərinizə çatdırırıq:

1. Qurani-Kərim böyük ilahi peyğəmbər olan İbrahim Xəlilə (ə) imamət məqamının verilməsini belə bəyan edir: "Yada sal o zamanı ki, böyük Allah Öz peyğəmbəri İbrahimi (ə) bir neçə imtahanla sınaqdan keçirtdi, o da ilahi imtahanlardan üzüağ çıxdı, bu zaman Allah buyurdu: "Mən səni insanlara imam və rəhbər qərar verirəm." İbrahim (ə) dedi: Bu rəhbərliyi mənim övladlarıma da əta edərsənmi?..."[1]

Bu kəlamdan iki həqiqət aşkar olur:

a) Qeyd olunan ayə "imamət"in "nübüvvət" və "risalət" məfhumundan fərqləndiyini göstərir. Çünki İbrahim (ə) bu ilahi imtahanlardan öncə, (onlardan biri də övladını qurban etmək barədə qərara gəlməsi idi) uzun illər nübüvvət məqamında idi. Bu da aşağıdakı dəlillə isbat olunur:

İbrahim (ə) qocaman yaşlarında olanda Allah-təala ona övlad (İsmaili və İshaqı) əta etdi. Quran onun dilindən nəql edərək belə buyurur: "Həmd olsun o Allaha ki, qocalıq dövründə mənə İsmaili və İshaqı əta etdi."[2]

Deməli, ilahi imtahanlardan biri olan, İsmailin Allah

---

[1] "Bəqərə surəsi", ayə 124
[2] "İbrahim" surəsi, ayə: 39

yolunda qurbanlıq edilməsinin ardınca böyük imamət məqamı İbrahimə verildi. O, bu imtahanı ömrünün son çağlarında vermiş və insanlara imam seçilmişdir, halbuki ondan əvvəl uzun müddət nübüvvət məqamında idi.[1]

b) Həmçinin "Və izibtəla İbrahimə Rəbbuhu bi kəlimatin" ayəsindən məlum olar ki, ilahi imamət və cəmiyyətə rəhbərlik məqamı nübüvvət və risalətdən çox-çox yüksək bir mərtəbədir. Çünki Quranın bəyan etdiyi kimi, imamət məqamı Həzrəti-İbrahimə (ə) nübüvvət və risalət məqamına çatdıqdan, ağır imtahanlardan çıxdıqdan sonra verildi. Səbəbi də aydındır; çünki ilahi imamət məqamı vəhyin əxz olunub risalətin insanlara təqdim olunması vəzifəsindən əlavə, ümmətə rəhbərlik və cəmiyyətin işlərinin düzgün şəkildə idarə olunmasını, onların kamal və səadətə çatdırılmasını da öhdəsinə alır. Təbiidir ki, belə bir məqam xüsusi əzəmətə malikdir ki, ona nail olmaq ardıcıl və ağır imtahanlardan çıxmadan mümkün deyildir.

2. Yuxarıdakı ayədən məlum olur ki, Mütəal Allah cəmiyyətə rəhbərlik və imamət məqamını Həzrəti-İbrahimə (ə) qarşısına çıxan ağır imtahanlardan başıuca çıxdıqdan sonra vermişdir. Bu zaman İbrahim (ə) Allahdan o məqamın öz övladlarında da olmasını istəmişdir.

Quranın digər bir ayəsinə əsasən məlum olur ki, Mütəal Allah İbrahimin (ə) istəyini qəbul etmiş, nübüvvət məqamından sonra cəmiyyətin rəhbərliyini və ümmətə hakimiy-

[1] Bu barədə "Saffat" surəsinin 99-102, "Hicr" surəsinin 53-54, "Hud" surəsinin 70-71- ci ayələrinə müraciət edin.

yəti də onun saleh övladlarına əta etmişdir. Quran bu barədə buyurur: "Biz İbrahim övladlarına (asimani) kitab, hikmət və böyük hakimiyyət əta etdik."[1]

Bu ayədən məlum olur ki, imamət və cəmiyyətə rəhbərlik nübüvvətdən tamamilə fərqli olan bir məqamdır ki, Mütəal-Allah onu Öz peyğəmbəri İbrahimə (ə), ağır imtahanları verdikdən sonra əta etmişdir. İbrahim (ə) Allahdan bu mənsəbi öz övladarında da qərar verməsini istədikdə Allah bu yüksək məqamın onun övladlarından ədalətli olanlarda qalmasını qəbul etdi və onlara asimani kitab, risalət və nübüvvət rəmzi olan hikmət və böyük mülk (rəhbərlik və hakimiyyət) əta etdi. Beləliklə, İbrahimin (ə) istəyi və duası qəbul olundu. Buna görə də onun zürriyətindən bəziləri, o cümlədən, Yusif, Davud, Süleyman və s. nübüvvət məqamından əlavə, cəmiyyətə rəhbərlik və hakimiyyət məqamına da çatmışdılar. Deməli, İmamət məqamı nübüvvət və risalətdən başqa bir məqamdır, ixtiyar və məs'uliyyətlərinin geniş olmasına görə çox yüksək dəyərə, üstün mövqeyə malikdir.

İmamət mövqeyinin üstünlüyü bu deyilənlərdən aydın olur. Belə ki, nəbi və rəsulun əhatə dairəsi nübüvvət və risalətin daşıyıcıları olması baxımından yalnız təzəkkür vermək və yolu işıqlandırmaqdır. Hərgah nəbi, yaxud rəsul imamət məqamına çatsalar, daha böyük və ağır məs'uliyyətləri öhdələrinə almış olur, bunun ardınca da nümunəvi və səadətli cəmiyyət yaratmaq üçün müqəddəs şəriət qa-

[1] "Nisa" surəsi, ayə: 54

nunlarını icra etməyə və ilahi proqramları həyata keçirməyə vəzifəli olurlar ki, öz ümmətlərini hər iki dünyanın xoşbəxtliyi olan bir yolda qərar versinlər.

Aydındır ki, belə böyük və ağır məs'uliyyətləri qəbul etmək mənəvi əzəmət, qüdrət və xüsusi ləyaqət tələb edir. Daim təmayüllərlə mübarizəni tələb edən, üzücü çətinliklərlə yanaşı olan bu vəzifə Allah yolunda daha artıq ürəyiyananlığı, yüksək dərəcədə səbirliliyi gərəkli edir. Bu isə Allah eşqi olmadan, Onun razılığını cəlb etmədən mümkün deyildir. Buna görə də Öz layiqli bəndələrinin ən fəzilətlisini, yəni İslam Peyğəmbərini ümmətə rəhbərlik və imamət məqamına seçərək onu iftixarlı etdi, cəmiyyətə rəhbərliyi və hakimiyyəti ona əta etdi.

## ZAHİRİ RƏHBƏRLİK (XİLAFƏT, HAKİMİYYƏT)

Deyirlər ki, Peyğəmbərdən (s) sonra heç bir şübhə qalmayacaq şəkildə o Həzrətin (s) canişinliyinə aid İslam Peyğəmbərindən (s) açıq-aşkar sifariş və tapşırıq olmayıb, habelə Qurani-Kərimdə də heç bir ayə gəlməyib. Əksinə, bu, müsəlmanların öz öhdəsinə buraxılmış bir mövzudur. İndi isə 1400 ildən sonra bu məsələnin üstünü açmağın heç bir faydası yoxdur.

Amma niyə faydası olmamalıdır? Bəs, onda tarix elmi nə üçündür? Heç faydası olmasa belə, "Keçmiş gələcəyin çırağıdır" deyiblər. Gəlin, bu məsələyə üç baxışdan (Quran, Hədis və Əql) yenə bir nəzər salaq və həqiqəti tapaq.

**1. Quran:**

Qurani-Kərim "Nəhl" surəsinin 80-ci ayəsində buyurur: "Və hər şeyin dolğun açıqlaması və aydınlaşdırıcısı, müsəlmanlar üçün başdan-başa hidayət, rəhmət və müjdə mənbəyi olan bu kitabı sənə nazil etdik."

Başqa bir ayədə buyurur: "Hər bir şeyin (Diqqət edin: "Hər bir şeyin" - H.) aydınlaşdırıcısı və açıqlaması müsəlmanlar üçün hidayət və rəhmət mənbəyi olan bu kitabdır." Əgər uşağınız sizdən "hər bir şeyin açıqlamasının onda yazıldığını, yəni heç bir şeyin cavabsız qalmadığını iddia

edən bu kitabda İslam aləminin hakimiyyətinə aid sözü yoxdur soruşsa", ona nə cavab verərsiniz?

Əgər mən hakimiyyətin çox mühüm məsələ olduğunu iddia etsəm, onu özbaşına buraxmaq Peyğəmbərin (s) şəninə yaraşmır. Ola bilər, məndən qəbul etməyəsiniz, amma baxın, bu mövzunun əhəmiyyəti ilə bağlı ikinci xəlifənin oğlu (Abdullah ibn Ömər) nə deyir. Məsudi "Mürucuz-Zəhəb" kitabında, İbn Əbdur-Rəbbih "İqaul-Fərid" kitabında, Müslim "Səhih"ində, İbn Əbil-Hədid "Nəhcül-Bəlağə"nin şərhində yazırlar: "İkinci xəlifə yaralanan zaman oğlu Abdullah ona dedi: "Ey Əmirəl-möminin, öz yerinə bir canişin təyin et. Çünki sənin çobanın qoyunlarını başsız otarsa, onu danlayarsan, elə isə Məhəmməd (s) ümmətini nə üçün başsız qoyasan? Yox, mütləq özünə canişin təyin et". İndi isə əgər, şiələr cəsarət edib soruşarlar: "Bu necə peyğəmbərdir ki, Abdullah ibn Ömər ondan çox bilir? Bəs, nə səbəbdən xəlifə özü oğluna demədi: "Ay oğul, xilafət məsələsi mənə aid olan məsələ deyil. Çünki Peyğəmbər (s) özü də müsəlmanları başsız qoyub getmişdir." Habelə, niyə demədi, müsəlmanların əlində olan Quran onlara kifayət edər? "

Düşünəndə tarixin ən əsaslı suallarından biri budur ki, nə üçün birinci xəlifə ikincisinin xəlifə olmasını vəsiyyət edərkən demədilər ki, belə bir vəsiyyət Peyğəmbərin (s) sünnətinin əksinə oldu? Niyə Əhli-sünnə qardaşlarımız sünnətə riayət etmədilər? Niyə demədilər ki, İslamda hakimiyyət vəsiyyət yolu ilə deyil, demokratik yolla həll olun-

malıdır?![1]

Əslində məsələ belə deyil. Əksinə, Allah-təala özü buyurduğu kimi, Qurani-Kərimdə hər bir şeyi açıq-aşkar cavablandırıb. O cümlədən Peyğəmbərdən (s) sonra hakimiyyət məsələsinin açıq şəkildə izahını verib. Belə ki, buyurur: "Ey iman gətirənlər, Allaha itaət edin, onun peyğəmbərinə və özünüzdən olan əmr sahiblərinə tabe olun."[2]

Həmçinin buyurur: "Allah siz Əhli-beytdən hər cür pislikləri təmizləmək və sizi paklığın bütün cəhətlərində pak etmək istəyir."[1]

Birinci ayədə açıq şəkildə buyurur: "Peyğəmbərə (s) itaət etməyiniz vacib olduğu kimi, "Ulul-əmr", yəni Allahın əmri ilə Peyğəmbərin (s) sizə təyin etdiyi əmr sahiblərinə də itaət vacibdir."

Əvvəlki səhifələrdə izah olundu ki, peyğəmbərlər ümumilikdə məsum olmalıdırlar və "ismət" dedikdə peyğəmbərliyin ayrılmaz bir şərti nəzərdə tutulur. Çünki onlar məsum olmasaydılar, ona qeyri-şərtsiz itaətləri vacib olmazdı. Bu məsələ ilə bağlı İslam dininin müxtəlif məzhəbləri (İstər əhli-sünnədə: Həmbəli, Hənəfi, Maliki, Şafei, istərsə də şiədə: Zeydi, İsmaili, İsna-əşəri) arasında heç bir ixtilaf yoxdur.

İkinci ayə isə məsum şəxslərin ünvanını tanıtdıraraq buyurur: Yalnız Peyğəmbərimizin Əhli-beytidir ki, hər cür

---

[1] Bu məsələ ilə əlaqədar geniş məlumat almaq istəsəniz, doktor Məhəmməd Ticaninin yazdığı kitablara müraciət edə bilərsiniz.

[2] "Nisa" surəsi, ayə 59

pisliyin onlardan təmizlənməsi və paklığın bütün cəhətlərinin onlarda cəm olması ilə məsum olublar.

Bu sübutlardan başqa Qurani-Kərimdə bir çox ayələr də bu məsələyə dəlalət edir. O cümlədən, "Maidə" surəsinin 55-ci ayəsində buyurulur: "Həqiqətən, sizin başçınız və işlərinizin ixtiyar sahibi yalnız Allah və onun peyğəmbəri, iman gətirənlər, namaz qılıb ruku halında zəkat verən kəslərdir."

İstər sünni, istərsə də şiə məzhəbindən olan təfsir alimləri bu ayənin Həzrəti-Əlinin (ə) vilayətinə işarə olmasını qəbul edirlər. Əhli-beyt (ə) şairi Mövlana Məhəmməd Füzuli də (r) bu ayənin Həzrəti-Əliyə (ə) aid olmasını qeyd edərək yazır:

*Üzük bəxş eyləmişsə sailə ol şah namaz üstə,*
*Əlində əhli-Həqqin hər nə varsa, nəzri-saildir.*

**2. Hədis:**

Peyğəmbərimizdən (s) nəql olunan "Ğədir" hədisi, "Səfinə" hədisi, "Səqəleyn" hədisi, "Haqq" hədisi, "Mənzilət" hədisi, "Əşireyi-Əqrabin" hədisi və s. hədislərdə xilafət məsələsi aydın şəkildə izah olunub.

Təbəri "Zəxairul-uqba", İbn Zəbbağ Maliki "Fusulil-Muhimə", Nəsai "Xəsais", Bəhrani "Ğayətul-Məram" kitablarında əhli-sünnədən 89 təriq, şiədən isə 43 təriq ilə "Qədir" hədisini nəql ediblər. Belə ki, İslam Peyğəmbəri

[1] "Əhzab" surəsi, ayə 33

(s) "Vida həcci"dən qayıdarkən "Qədir-Xum" səhrasına çatanda əmr etdi. O çölü təmizlədilər, irəlidə gedənlər qayıtdılar, arxadan gələnlər çatdılar (120.000 nəfər qadın və kişi). İslam Peyğəmbəri (s) geniş və ətraflı çıxış etdikdən sonda buyurdu: "Mən sizin ixtiyar sahibiniz deyiləmmi?" Cavab verdilər: "Bizim ixtiyarımız səndədir". Sonra buyurdu: "Mən kimin mövlası və ixtiyar sahibiyəmsə, məndən sonra onun mövlası və ixtiyar sahibi Əlidir."[1]

Peyğəmbərimiz (s) buyurub: "Əli haqq ilə, haqq da Əli ilədir. Əli Quranla, Quran da Əli ilədir. İçinizdən ən qazi olan Əlidir. Əməllərinizin ölçüsü Əlidir. Möminlə münafiqi bir-birindən seçməyin ölçüsü Əlidir. Mən elmin şəhəriyəm, Əli isə onun qapısıdır" və s. Əhli-beytdən (s) geniş bir hədis şiə yolu ilə nəql olunub. Bu hədis İslam Peyğəmbərinin (s) gələcək zamandan xəbər verdiyini açıq-aşkar göstərir. Bu hədis möcüzə sayılır. Hədis belədir: "Məndən sonra vəsilərim on iki nəfərdir. Hər biri Qureyş tayfasındandır. Birincisi Əlidir (ə), axırıncısı Mehdidir (ə.f). Onların doqquzu Hüseynin (ə) övladlarındandır, doqquzuncusu Qaimdir (ə.f). Onun üçün uzun müddət qeybət var və yer üzünü pislik, zülm və fəsad doldurduğu vaxt (Mehdi (ə.f) öz qiyamı ilə yer kürəsində ədalət və əmniyyət yaradacaq." İnşaallah.[2]

---

[1] Həm yuxarıda qeyd olunan hədisləri, həm də Qədir-Xum hədisini əhli-sünnət qardaşlarımızın kitablarına əsasən ("Qədir günündən Aşurayadək" kitabında) görə bilərsiniz.

[2] Həcc səfərinə gedən bacı və qardaşlar, Mədinə şəhərində peyğəmbərin məscidində olarkən orada olan müsəlmanlardan xahiş

Bu hədisin İslam Peyğəmbəri (s) tərəfindən ifadə edilən ən böyük möcüzələrdən sayılmasını iddia etməyimiz buna əsasəndir ki, İslam peyğəmbərinin (s) dünyasını dəyişdiyi zaman nəvəsi Həzrəti-Hüseyn ibn Əlinin (ə) altı yaşı var idi, lakin hədisdə oxudunuz ki, Peyğəmbərimiz (s) buyurub: Onların doqquzu Hüseynin (ə) övladlarındandır. Demək istəyirəm ki, İmam Hüseyn (ə) altı yaşında olduğu halda İslam Peyğəmbərinin (s) gələcəkdən xəbər verərək onun nəslindən olan doqquz nəfərin adını və tərcümeyi-halını sadalaması möcüzə deyilmi?

**3. Əql:**

Əql sahibi olan insanlar belə mühüm məsələnin yaddan çıxmasının qeyri-mümkün olduğunu söyləyirlər. Əgər bizlərdən hər birinin atası, oğlu, qardaşı on nəfərlik işçisi olan bir fabrikdə sədr olsa, hətta bir gün işə getməsə, ondan şirkəti kimə tapşırırsan?" deyə soruşsaq, cavabında: "Heç kimə, elə-belə" desə, deməriikmi: "Necə elə-belə?"

Axırüz-zaman Peyğəmbər (s) 124.000 peyğəmbərin gətirdiyi dinin nəticəsi və sona çatdıranı adlanır. Qurani-Kərim də bu məsələni təsdiqləyərək buyurub: "Məhəmməd (s) sizlərdən heç birinin atası deyil, lakin o, Allahın rəsulu və peyğəmbərlərin sonuncusudur. Allah həmişə hər şeyə agahdır"[1]

---

edin: Məscidun-nəbinin içərisində olan iki üstü açıq hissənin ətraf divarlarında yazılan adları sizin üçün oxusunlar. On iki imamın, hətta Mehdi Sahib-əz Zamanın (ə.f.) mübarək adı orada yazılıb. Mehdinin (ə.f.) adının orada olması şiənin iddiasına ən böyük sübutdur.

[1] "Əhzab" surəsi, ayə 40

O Həzrət (s) özü də buyurub: “Məndən sonra Peyğəmbər gəlməyəcək.” O, həyatının son anına qədər də yaşadığı ölkənin siyasi baxımdan rəhbərliyini etmişdir. Dünyasını dəyişməsindən bir neçə ay öncə Həcc səfərində olduğu zaman Ərəfat çölündə buyurdu: “ Ola bilər, bu, mənim axır səfərim olsun, daha məni bir daha burada görməyəsiniz”. Yəni, özü də həyatının axır günləri olduğunu bilirdi. Habelə, dünyasını dəyişməzdən öncə bir neçə gün xəstə halda evdə yatmışdır. Necə ola bilər ki, Peyğəmbər (s) Özü, dəfələrlə: “Ey müsəlmanlar! Yatarkən vəsiyyət məktubunuz başınızın altında olsun” buyurduğu halda, Özündən sonra müsəlmanları ən mühüm məsələ ilə bağlı təklifsiz qoyub getsin? Bu təəccüblü deyilmi?

## İSLAM DİNİNİN YAYILMASI

Təbiidir ki, İslam maarifinin yayılıb və dünya səviyyəsində ümumiləşməsi İslam Peyğəmbərinin (s) ən böyük arzularından biri olub. Belə ki, bu məsələni (furuid-dindən) iki baxımdan qərar verib: Birincisi müsəlman üçün imkan dairəsində onlara əməl etməyi vacib sayıbdır. “Əmr be məruf”, yəni imkan dairəsində hidayət qapılarını başqalarının üzünə açmaq. İkincisi, “Nəhy əz münkər”, yəni pis və yaramaz işlərdən insanları qorumaq.

Quran-Kərimdə buyurulur: “Siz (müsəlmanlar) insanlara zahir olmuş ən yaxşı ümmətsiniz. Bəyənilən işə əmr edir, çirkin işdən çəkindirir və Allaha iman gətirirsiniz.”[1]

Tarix İslam Peyğəmbərindən (s) sonra bu iki ən mühüm vəzifənin yaddan çıxmamasına ən böyük şahiddir.

Bəli, “İslam” adı Səudiyyə Ərəbistanından çıxdı və az bir zamanda (təxminən, birinci yarım əsrdə) yaxın şərq ölkələrindən tutmuş Afrika qitəsinin yarısına qədər İslam adı ilə ərəb hakimiyyətinin kölgəsi altına çəkildi. Mavərannəhrdən[2] tutmuş Cəbəlüt-Tariq boğazına qədər günün beş vaxtında “Əşhədü ən la ilahə illəllah, Əşhədu ənnə Muhəmmədən Rəsulullah” sədası minarələrdən ucalıb, məscidlərdə

[1] “Ali-İmran” surəsi, ayə 110
[2] Buxara-Səmərqənd

müsəlmanlar namaz sıralarında durub namaz qılıblar.

Bu sözləri oxuyan hər kəs soruşa bilər: Bəs, nə istəyirik? Belə cavab verərik ki, heç bir şey istəmirik. Yalnız bilməliyik ki, söhbət ərəb hakimiyyətinin "İslam" adı ilə dünyanın dörd bir tərəfini tutmasından deyil, İslam maarifinin yayılmasından gedir.

Söhbət bu günkü dünyamızdan getmir. Əksinə, İslam Peyğəmbərinin (s) vəfatından otuz il sonra, yəni hicrətin 41-ci ilində Əbu Süfyanın oğlu Müaviyyənin Kufə şəhərində vali olduğu zaman Kufə məscidinin minbərində "Mən sizin namaz qılıb oruc tutmağınız üçün müharibə etmirdim. Mən yalnız sizlərə xəlifə olmaq üçün müharibə edirdim" deməsi və oğlu Yezidin, daha sonra Həkəmin oğlu Mərvan və oğlanlarının hicrətin 132-ci ilinə kimi Bəni-Üməyyə tayfasının krallarının İslam xilafəti adına, İslama, Qurana, mənəviyyata etdikləri xəyanət və müsəlmanlar əleyhinə etdikləri ən böyük cinayətlərdən gedir.

Onların hakimiyyəti dövründə Mədinə şəhərinə (Peyğəmbərin (s) şəhərinə) basqın edilib. Əli ibn Hüseyn Mədaini yazır: "Hirrə müharibəsi"ndən sonra Mədinə qızlarının min nəfərdən çoxu hamilə olaraq uşaq dünyaya gətirdilər. Tarixdə o uşaqlar "Hirrə övladları" adlandılar. İki dəfə Məkkə şəhərinə basqın edilərək, Kəbəyə od vurulub yandırılaraq viran edilib.

Əbu Süfyan oğlu Muaviyyənin İslam maarifindən xəbəri yox idi. Yoxun nəyini yaymalı idi. Əksinə, özünün iddia etdiyi kimi, məqsədi İslam və Peyğəmbərin (s) adını batır-

maq idi. Amma bu hədəfinə zahiri şəkildə əməl edə bilmədiyi üçün beytul-maldan pul ayıraraq tamahkar insanları aldadıb, əsir tutub Peyğəmbərin (s) adından hədislər uydurdu ki, o saxta hədislər haqqı batillə qarışdırsınlar, insanlara haqqı tapmaq çətinləşsin.

Yalnız bu bir iddianı sübut üçün deməliyəm ki, bildiyiniz kimi, Əhli-sünnətdə hər biri "səhih" adlanan altı hədis kitabı var. Onlardan biri "Səhihi-Buxari"dir. Müəllifi Abdullah ibn Məhəmməd ibn İsmayil ibn İbrahim ibn Muceyrə Buxaridir. Hicrətin 194-cü ilində Buxara şəhərində doğulub və hicrətin 256-cı ilində vəfat etmişdir.

Bu şəxs həmin əsərinin müqəddiməsində yazır: "Mən 1080 nəfərdən 600.000 hədis eşidib qeyd edərək cəm etdikdən sonra yazmağa başladım". Əziz oxucu bilməlidir ki, "Səhihi-Buxari" kitabında təkcə 7257 hədis qeyd olunub. Bu sözlərin mənasının nə demək olduğunu bilirsinizmi? Yəni, Buxari 592.743 hədisin saxta olduğunu başa düşərək, öz kitabında onları qeyd etməyib. İndi Bəni-Üməyyə tayfasının İslama necə böyük xəyanətlər etdiyi aydın olurmu? Həmçinin deyə bilərik ki, ağalar zəhmət çəkib, təxminən, hər doğru hədisin qarşılığında 99 saxta hədis düzəldiblər.

Bu kitabda məqsədimiz mövzunu qısa şəkildə aydınlaşdırmaqdır. Yoxsa, siz əzizlərə əhli-sünnə qardaşlarımızın yazdığı kitablara istinad edərək, Bəni-Üməyyə tayfasının hakimiyyəti dövründə İslamın kökünə dəyən zərbələri, habelə Abbasilərin hakimiyyəti dövründə baş vermiş cinayətləri şərh edərdim. Həqiqətən, Peyğəmbər (s) Əhli-bey-

tinin (ə) çəkdiyi zəhmətlər və İslam dini yolunda verdikləri qurbanlar olmasaydı, İslam dini birinci əsrin sonlarına çatmayacaq və yalnız tarix kitablarında belə bir dinin adı ilə qarşılaşacaqdıq. Bütün bunlara baxmayaraq, çox təəssüf ki, əhli-sünnət qardaşlarımız ağı qaradan seçmədən, yaxşını pisdən ayırmadan, ucdantutma hicrətin 650-ci ilinə qədər xəlifə adlanan hər bir kəsə itaəti özlərinə vacib bilibələr. Onlar Vəlid ibn Yezid kimi həyasız insana, Yezid ibn Müaviyə kimi dinsiz şəxsə "Əmirəlmöminin" (Möminlərin əmiri) ləqəbi veriblər!

Çünki onlar öz hakimiyyətlərindən başqa heç bir şeyə fikir vermirdilər. Buna görə də Quranı başa düşməkdə öz acizliklərini etiraf ediblər. Bu iddiaya nümunə olaraq bir hədis nəql edirəm. "Təfsiri-Fəxri Razi", "Təfsiri-Nişaburi", "Mənaqibi-Xarəzmi", "Sunəni-Kubra", "Zəxairul-Üqba" kitablarının müəllifləri öz yazdıqları kitablarından bu hədisi şərh ediblər: "Ömər ibn Xəttabın hakimiyyəti dövründə bir ərli qadın zina həddinə məhkum oldu. Qadının bacısı narahat halda Əli ibn Əbu-Talibin (ə) yanına gəlib bacısının günahsız məhkum olduğunu bildirdi. Əli (ə) məscidə gəlib verilən hökmə öz etirazını bildirdi. Xəlifə dedi: "Şahidlər bu qadının ərinin neçə müddətdir səfərdə olduğuna şəhadət veriblər. Altı aydır, səfərdən qayıdıb. İndi isə sağlam bir uşaq dünyaya gətirib. Bunun mənası zinadan başqa nə ola bilər?

Əli (ə) dedi: Allah-Təala Qurani-Kərimdə buyurub:

"Analar öz övladlarına tam iki il süd verməlidir."[1] Başqa bir ayədə buyurub: "Onun (körpənin-ana bətində) daşınması və süddən ayrılması (Ana bətnində qalması ilə süd əmmə müddəti üst-üstə) otuz aydır."[2]

Əli (ə) bu iki ayəni oxuyarkən buyurdu: "Otuz aydan iki il (24 ay) çıxılsa, yerdə nə qalar? Dedilər: "Altı ay". Deməк Allah-təalanın buyurduğuna əsasən uşaq altı ayda kamil surətdə doğulub sağlam qala bilər. Belə isə hansı günaha görə bu qadını ittihamlayıb daş-qalaq hökmü verirsiniz?" Xəlifə dedi: "Əgər Əli (ə) olmasaydı, mən həlak olardım".

Qurani-Kərimi müəllimsiz anlamaq olmaz. Bu kitabın ən böyük müəllimləri Əhli-beytdir (ə) ki, bu kitab onların evində nazil olub. Evin sahibi onlardır. Buna görə də Qurani-Kərimin təvil və təfsirini onlardan başqa heç kəs başa düşə bilməz. İbni-Əbil Hədid Mötəzili Şafei "Nəhcül-Bəlağə" kitabının şərhinin 20-ci cildinin müqəddiməsində yazır: "Səhabə arasında fəqih (yəni, fiqh elmini ən çox başa düşən və fiqh elmi ilə daha çox tanış olan) iki nəfərdir: "Abdullah ibn Abbas və Ömər ibn Xəttab". Hər ikisinin də elmi Əlinin (ə) elminə bağlanır... Daha sonra yazır ki, Abdullah ibn Abbasın açıq-aşkar Əlinin (ə) tələbəsi olması, Ömər ibn Xəttabın dəfələrlə "Əgər Əli (ə) olmasaydı, Ömər həlak olardı" deməsi buna sübutdur.

*Məhəmməd Ticani Səmavi. Doğrularla birgə olaq.

---

[1] "Bəqərə" surəsi, ayə 233
[2] "Əhqaf" surəsi, ayə 15

## MƏNƏVİ RƏHBƏRLİK

İnsan fikir və düşüncəsi ilə dərk edir: yox idi, var olub və yenə də yox olacaq. Bu ikisinin orta vəziyyəti onun həyat və yaşayış dövranını təşkil edir. Buna görə də yaşadığı zaman kəsiyindən qənaətlə istifadə etməyə çalışır. Amma bilməliyik ki, insan "haradan gəlib, haraya gedir?" sualına cavab tapmayana qədər bu ikisinin arasında olan həyatdan səmərəli istifadə edə bilməyəcək.

Hər bir insan bilməlidir ki, bu üç suala (haradan gəlib, nə üçün gəlib, haraya gedir) aid dinin çox ciddi şəkildə sözü var, hətta ağıl üçün dindən kömək almadığı təqdirdə həll edilməsi problem olan ölümdən sonrakı həyat da dinin nəzərindən yayınmayıb. Belə deyə bilərik ki, "ölümdən sonrakı həyat" din maarifi olmadan izah olunmayan bir məfhumdur.

Ölüm insan üçün dünya həyatının sonuncu günü, axirət həyatının isə ilk günü hesab olunur. İnsanın həqiqəti deyir ki, onun həyatının sonunda səadətə yetişməsi nəfsinin öhdəsindədir. Nəfs səadətə yetişməyin təkcə yolunun "Mənəvi rəhbərlər"in sözünə qulaq asıb onların göstərdikləri yolla getməkdə olduğunu bilməlidir.

Mənəvi rəhbər Allah-təalanın yer üzündə canişinləri və "Güzgü" kimi Allah-təalanın nurunu insaniyyət aləminə yayan kamil insanlardır. "Kamil insan" dedikdə vücudla-

rında bütün insani dəyərlər ali səviyyədə, bir-birinə uyğun səviyyədə inkişaf edən insanlar nəzərdə tutulur.

"Kamil insan" dedikdə, Həzrəti-Məhəmməd ibn Abdullah (s) və onun Əhli-beytindən (ə) olan imamlar (Onlar Allah-təalanın xüsusi lütfü ilə insaniyyət aləminin ən yüksək rütbəsində və dərəcəsində qərar tutublar) nəzərdə tutulur. Belə ki, insan onların ardınca getməsə, həqiqət yolunu azması və dinində zəlalətə düşməsi yəqindir.

İmamət yalnız kamil insanların haqqıdır. Allah-təala Qurani-Kərimdə buyurur: "Rəbbinin İbrahimi bəzi işlərlə imtahana çəkdiyi zaman o (İbrahim) hər şeyi kamil surətdə yerinə yetirdi. Rəbbi dedi: Həqiqətən, mən səni insanlara imam və rəhbər etdim. (İbrahim) dedi: Övladlarımdan necə? Dedi: Mənim əhdim zalımlara nəsib olmaz."[1]

Həm "əl-Mizan" təfsirində Əllamə Seyyid Məhəmməd Hüseyn Təbatəbai Təbrizi, həm də "əl-Bəyan" təfsirində Ayətullah-Uzma Seyyid Əbül-Qasim Xoyi (Allah-təala hər ikisinə rəhmət etsin) yazıblar ki, ağıl baxımından insanlar dörd qrupa bölünür:

1.Dünyaya zalım gəlib, zalım gedənlər, yəni, ömrünün əvvəlindən axırına kimi zalım olanlar.

2. Dünyaya pak gəlib, pak gedənlər, yəni, həyatı boyunca heç vaxt zalım olmayanlar.

3. Dünyaya zalım gəlib, məzlum kimin gedənlər, yəni, ömrünün əvvəlində zalım olub, sonra tövbə edənlər.

4. Dünyaya pak gəlib, dünyadan zalım gedənlər, yəni,

---

[1] "Bəqərə" surəsi, ayə 124

həyatının axır hissəsində zalım olanlar.

Sonra nəticə olaraq buyurublar: "Şübhəsiz, birinci və dördüncü səviyyədə olan (yəni, ömrünün bütün, yaxud son hissəsində zalım olan) insanlara imamlıq və rəhbərlik məqamı arzu etmək Həzrəti-İbrahimin (ə) şənindən uzaqdır. İki hissə qalır (heç bir zaman zalım olmayan və ömürlərinin əvvəlində zalım olub sonunda tövbə edən insanlar), amma Allah-təala Həzrəti-İbrahimin (ə) bu istəyini belə cavablandırır: "Mənim əhdim zalımlara nəsib olmaz", yəni imamət məqamının yalnız ömürləri boyu zülm etməmələrindən əlavə, vücudlarında bütün insani dəyərlərin ən yüksək həddə, bir-birilərinə uyğun səviyyədə inkişaf etdiyi kamil insanların haqqı olması çox incəliklə məlum olur.

Bu mənalarda "imamət" məqamı o şəxsin öz vücuduna bağlı olan zati bir haqdır. Başqa insanların onu qəbul edib-etməməsi məsələnin mahiyyətini dəyişə bilməz. Nə üçün? Bütün fəzilətlər imamın vücuduna cəm olduğu, onun özü ölçü və əməllərin mizanı olduğu üçün başqalarının onu qəbul edib, yaxud rədd etməklə öz münasibətləri ilə hidayət və ya zəlalət yolunu seçməkdə ixtiyar sahibidirlər.

"Tövbə" surəsinin 105-ci ayəsi yalnız bir mənadə izah oluna bilər. Belə ki, Həzrəti-İmam Rzadan (ə) soruşuldu: "Ey peyğəmbərin (s) övladı, necə ola bilər ki, siz bizim əməllərimizi görəsiniz?" Buyurdu: "Məgər Allah-təala buyurmayıb: "De: İstədiyinizi edin ki, tezliklə əməllərinizi Allah, Onun peyğəmbəri və möminlər görəcəklər." Sonra buyurdu: "Sizin əməllərinizi görən mömin insanlar bizik."

Habelə, səkkizinci İmamın (ə) buyuruğuna əsasən, 14 mə-

sumun (ə) hər birində bu məqam dəyişməzdir və əməldə də sübuta yetib. Əlbəttə, münafiqlərdən başqa, hətta ibtidai insanlara belə bu anlayışın həzminin azacıq çətin olması məlumdur. Çünki vilayət yolu çox məşəqqətlidir, Haqq yolunu tapmağın müəyyən qədər çətinliyi var. Bu iş insandan çox zəhmət tələb edir. Məşhur "Kəşşaf" təfsirinin müəllifi əhli-sünnə alimi Zəməxşəri yazır ki: "Şübhələr və ixtilaflar çoxaldığı zaman hər kəs özünün doğru və düzgün yolda olduğunu iddia edir. Mən isə "Lailahə illəllah" şüarı ilə Əhməd ilə Əliyə olan sevgimə bağlanmışam. Necə ola bilər ki, Əshani-Kəhfin macərasında çoban və iti əshabi-kəhfə qoşulduğuna görə Allah tərəfindən rəğbətlə qarşılanır və Qurani-Kərimdə onlardan bəhs edilir. Amma mən Peyğəmbərin (s) Əhli-beytini (ə) sevdiyimçün şəqavət əhli hesab edilirəm? Əgər mənim günahım budursa, mən heç vaxt buna görə tövbə etmərəm".

Buradan aydın olur ki, şeytan insanları doğru yoldan çəkindirməyə çalışır. Bu barədə Qurani-Kərimdə oxuyuruq: "(İblis) dedi: İzzətinə and olsun ki, sənin xalis və seçilmiş bəndələrin istisna olmaqla, onların (insanların) hamısını aldadıb doğru yoldan azdıracağam."[1]

Beləliklə, gəlin, bir daha bu iki ayəni Qurani-Kərimdən birlikdə oxuyub mənası haqda düşünək. Bəlkə məsələnin həllinə yaxınlaşdıq, İnşallah:

"Allah yolunda öldürülənlərə ölü deməyin, əksinə (on-

---

[1] "Sad" surəsi, 82 və 83-cü ayələr

lar) diridirlər və lakin siz dərk etmirsiniz."[1]

"Allah yolunda öldürülənləri ölü zənn etmə, əksinə onlar diridirlər və onlara Rəbbi yanında ruzi verilir."[2]

Bu ayələr onlara şübhə edilməsi mümkün olmayan, Allah-təalanın buyurduğu ayələrdir. Yalnız məsələni özümüz üçün təhlil etmək qalır. Necə ola bilər ki, biz onların diriliyini dərk etməyək? Onun da cavabı Qurandadır. Buyurur: "Siz onu dərk edə bilməzsiniz". Təbiidir ki, öləndən sonrakı həyatı bizlər başa düşə bilmərik, amma Allah-təalanın buyurduğuna görə inanmalıyıq. Bu barədə kitablarda kifayət qədər məlumatlar qeyd olunub. Misal olaraq, "Uyuni-Əxbarur-Rza" kitabında yazılıb: "Həzrəti-İmam Riza (ə) Mədinədən Xorasana gəldiyi zaman Səbzəvar şəhərində əmr etdi ki, bir bərbər gəlib baş və üzünün tüklərini azaltsın. Qoca bir bərbər gətirdilər, Həzrətin (ə) tüklərini o yan-bu yana çevirdiyi halı özü üçün çox dəyərli bilirdi. İmamın (ə) ətrafında dolandığı və onun tüklərini səliqəyə saldığı üçün fəxr edirdi. Ürəyindən keçdi ki, görəsən ağanın lütfü mənə nə olacaq. Bir az sonra əlindəki qayçının qızıl olduğunu gördü. Diqqətlə baxdıqda sehr etmədiyini gördü. (Dırnaqarası deyilməlidir ki, savadından asılı olmayaraq insanların bəzisi, həqiqətən də əldə olan fürsətdən əla dərəcədə istifadə etməyi bacarır.) Bərbər qayçıya baxarkən ərz etdi: "Ağacan, kaş ki, dünya malı əvəzinə axirətimə bir lütfünüz olaydı". Həzrət (ə) buyurdu: "Biz, Ali-

[1] "Bəqərə" surəsi, ayə:154
[2] "Ali-İmran" surəsi, ayə: 169

Məhəmməd (s) verdiyimiz hədiyyəni geri qaytarmarıq. İndi isə istəyin nədir?" Ərz etdi: "Ölən zaman başımın üstünə gələsiniz." Həzrət (ə) buyurdu: "Söz verirəm." Elə də oldu.

## İKİ ƏN BÖYÜK ŞAHİD

Daha öncə, bir neçə səhifə qabaqda qeyd etdik ki, şiə anlayışında imamət məqamı "həm məkan, həm də zaman uzaqlığından" üstündür. İndi isə demək istəyirəm ki, belə olduğu halda üstünlüyü Quran təsdiq edir, inkar da edilə bilməz.

"Allaha və Onun peyğəmbərlərinə kafir olanlar istəyirlər ki, Allah və Peyğəmbəri (s) arasında ayrılıq salsınlar. (Yəni deyərlər ki, bunlar Allahın göndərdikləri deyillər). Və deyərlər ki, biz peyğəmbərlərin bəzi dediklərinə iman gətirmərik. İmanla küfr arasında bir yol seçmək istəyirlər". "Bütün bunlar həqiqətən kafirdirlər. Biz kafirlərdən ötrü rüsvayedici əzab hazırlamışıq".

### *1. Asəf ibn Bərxiya*

Qurani-Kərimin "Nəml" surəsində bir hadisə nəql edilir. O hadisənin xülasəsi belədir: Allah-təalanın izni ilə quşların da dilini bilən Həzrəti-Süleymana (s) Hüdhüd xəbər gətirdi ki, "Səba" ölkəsində tək Allaha deyil, günəşə səcdə edən bir qadın hökmranlıq edir. Həzrəti-Süleyman (ə) məktub göndərərək onu tək Allaha ibadət etməyə dəvət etdi. O qadın (Bilqeys xanım) məktuba cavab olaraq Həzrəti-Süleymana (s) hədiyyə yolladı. Nəhayət, bir gün bu

mövzu gündəmdə olarkən və Həzrəti-Süleyman (ə) öz ölkəsinin böyükləri ilə məşvərət etdiyi zaman onlara dedi: “Hansınız o qadının taxtını mənə gətirə bilər? Cinlərdən olan (çox zehnli və nəhəng) İfrit dedi: “Mən onu sən yerindən qalxmamış sənin yanına gətirərəm. Əlbəttə, mənim bu işə qüvvəm və etibarım var”. Kitabdan bir qədər elmi olan dedi: “Mən onu bir göz qırpımında sənin yanına gətirərəm”. Süleyman (ə) onu taxtı yanında görərkən dedi: “Bu Rəbbimin fəzlindəndir və mənim şükr edib, yoxsa nankor olacağımı yoxlamaq üçündür.”[1]

Qurani-Kərimə təfsir yazanların bir çoxu kitabdan bir qədər elmi olan şəxsin Həzrəti-Asəf ibn Bərxiya olduğunu yazıblar. O, Həzrəti-Süleymanın (ə) vəzir və canişini olaraq Allah-təala tərəfindən Bilqeys xanımın taxtını “Səba” ölkəsindən Qüdsə gətirəcək bir qüdrətə sahib olmuşdur.

### 2. Həzrəti-Əli ibn Əbu Talib (ə)

“Kafirlər deyirlər: Sən Allahın peyğəmbəri deyilsən. De: Mənimlə sizin aranazda Allahın, həmçinin kitab elminə malik olan kəsin şahid olması yetər.”[2]

Əhli-sünnə alimi Həskaninin “Şəvahidut-Tənzil” kitabından kitab elminə malik olan kəsin Həzrəti-Əli ibn Əbu Talib (ə) olması bildirilir.

Biz də Qurani-Kərimdə olan bu iki ibarənin mənasını

---

[1] “Nəml” surəsi, 38, 39, 40-cı ayələr
[2] “Rəd” surəsi, ayə 43

başa düşməliyik: "İndəhu ilmun minəl-kitab" - "Kitabdan bir qədər məlumatı olan", "Və mən indəhu ilmul-kitab"- "Kitabın elminə malik olan". Yeri gəlmişkən deyə bilərik ki, tərcümə olunan iki cümlə ərəb dilində ifadə etdikləri mənaları tam ifadə etmir. İfadə etməsi mümkün də deyil, lakin bunu bilirik ki, bu iki şəxsin biri kitab elmindən bir qədər bilirmiş, digəri isə kitab elminə malik imiş.

Hədislərimizdə kitab elmi belə izah olunub: Kitab elmi 72 hərfdir. Cənab Asəf ibn Bərxiya ondan bir hərf bilirmiş, lakin o bir hərfin nə qədər qüdrətli olduğunu oxuduq.

Qurani-Kərim vücudunu Peyğəmbərin (s) nəfsi (özü) kimi bildirdiyi kitab elminə malik olan şəxsə gəlincə Peyğəmbərin (s) risalətinə şahid olan mövlamız və rəhbərimiz Həzrəti-Əbəl-Həsən Əli ibn Əbu Talibdir (ə). İndi isə o mübarək vücudun barəsində nəql olunmuş minlərlə hədis və rəvayətlərdən yalnız o Həzrətin (ə) dünyaya gəlişinə və elminə aid bir neçə hədis nəql edək.

O Həzrətin (ə) Kəbədə dünyaya gəlməsi barədə kitablar belə yazır: "Anası Xanım Fatimə binti-Əsəd özündə doğuş ağrısı hiss etdiyi zaman Kəbə evinə tərəf yaxınlaşarkən Kəbə evinin divarı müstəcar tərəfdən açıldı. Xanım Fatimə başa düşdü ki, evin içinə daxil olmalıdır. Divar bağlandı və üç gündən sonra qucağında uşaqla birlikdə Kəbə evindən çıxdı.

Cənab Asəf ibn Bərxiya "kitabdan bir qədər elmi olan" şəxsdir, lakin "Kitab elminə malik olan" şəxsin vücudundan dünyanın işıqlanması üçün Kəbə evi parçalanır.

Oxucular bu hadisənin yalnız şiə kitablarında nəql

olunduğunu düşünə bilərlər, lakin nəql etdiyimiz hadisəni əhli-sünnə qardaşlarımızın bir çoxu da yazmışdır. O cümlədən, Hakim Nişapuri "Əl-Müstədrək" kitabının üçüncü cildinin 483-cü səhifəsində bu hadisəni nəql edib təsdiq edərək yazıb: "Əlinin (ə) Kəbə evində doğulması mütəvatir hədislərdəndir."

Hafiz Gənci Şafei "Kifayətut-Talib" kitabının 407-ci səhifəsində yazıb: "Nə Əlidən (ə) qabaq, nə də sonra heç kəs Kəbə evində doğulmayıb."

"Təfsiri-Kəbir"in müəllifi Seyyid Məhəmməd Alusi yazır: "Cümə günü Rəcəb ayının 13-də Əli (ə) Kəbə evində dünyaya gəldi. Belə ki, ondan qabaq heç kəs orda doğulmamışdır".

Misir respublikasının müasir məşhur yazıçısı cənab Doktor Əqqad "Əbqəriyyətul-İmam Əli (ə)" kitabının 7-ci cildinin 43-cü səhifəsində həmin mənanı gözəl şəkildə ifadə edərək yazır: "Əlinin (ə) Kəbə evində doğulması ən böyük şərəf sayılır. Belə ki, o Həzrət anadan olduğu vaxtdan vücudu tövhid kəlməsi ilə birləşmişdir".

Həzrəti-Məhəmmədin (s) "Vida həcci"ndən qayıdarkən Həzrəti-Əlinin (ə) vilayət və canişinliyini bəyan etməsini sünni mənbələri də təsdiqləmişdir. Əhli-sünnə alimlərindən olan Həfiz Əbdüləziz deyir: "Qədir hədisi təvarutun (inkar edilməsi mümkün olmayan) ən uca dərəcəsində dayanmışdır".

Hicri VI yüzilliyin Əhli-beyt (ə) şairi olan Fənckərdi öz şeirində yazır:

*La tunkirənnə Qədirə-xummu innəhu,*
*Kəşşəmsi fi işraqiha bəl əzhəru.*
*Fihi imamətu hədərun və kəmalihu,*
*Və Cəlalihu həttəl-qiyaməti tuzkəru.*

(Sən Qədir-Xum hadisəsini inkar etmə, çünki aşkarlıqda günəş kimi, hətta ondan daha işıqlıdır. O gündə Əlinin (ə) iməməti, cəlaləti və kamalı aşkar olub, Qiyamətə qədər davam edəcəkdir).

İslam dünyasının böyük ustadı Əbdullah Əlayili "Livan" radiosunda 18 zilhiccə 1380 hicri-şəmsi tarixində apardığı söhbətində demişdir: "Qədir-Xum bayramı İslamın bir bölümüdür. Bunu inkar edən, İslamın əsasını inkar etmişdir".

Qədir-Xum günü tarixin, Həzrəti-Əli (ə) eşqinin odunu düşüncələrə salıb, ürəklərdə ümid və fərəh yaradan günlərindəndir. Mühəqqiq İsfəhani "Əl-ənvarül-qüdsiyyə" qəsidəsində bu bayramı belə vəsf edir:

*İdul-qədiri əzəmul əyadi,*
*Kəm fihi lillahi minəl-əyadi.*
*Əkmilu fihi dinəhul-mubina,*
*Summər-təzəl-İslamə fihi dina.*

(Qədir bayramı bayramların ən əzəmətlisidir. Tanrının o gündə əlləri var. Allah o gündə dini mükəmməl etdi. Və bu dinin bəşər dini olmağına razı oldu.

## Qərb alimlərinin Ğədir-Xum hadisəsinə münasibəti

İslam dininin müqəddəs istinad mərkəzi olan Qurani-Kərimdən və Peyğəmbərimizin (s), həmçinin məsum imamlarımızın (ə.m.) Ğədir-Xum hadisəsinə olan münasibətindən əlavə Qərb və Şərq alimlərinin də buna münasibəti müsbət olmuşdur.

XVIII əsr görkəmli fransız yazıçısı, filosofu və dramaturqu Volter "Xalqların adət-ənənələri haqqında" adlı kitabında Əlinin (ə) haqqında mühüm sənədlərə toxunaraq yazır: "Peyğəmbərlərin (ə) sonuncusunun istək və iradəsi yerinə yetmədi. O, ölüm yatağında olarkən Əlini (ə) öz canişini seçmişdi. Lakin onun vəfatından sonra bu istək həmin əsrin bir sıra nüfuz sahibləri tərəfindən nəzərə alınmadı". Müəllif bu kitabında Həzrəti-Əlinin (ə) xəlifəliyini qanunilik baxımından sənədləşdiyini göstərmişdir. Eyni zamanda yazıçının əqidəsinə görə islam Peyğəmbəri (s) əmisi oğlu və kürəkəni olan Əlinin (ə) canişinliyini açıq-aydın və qətiyyətlə vəsiyyət etmişdir. Hətta ölüm yatağında olarkən öz səhabəsindən qələm və mürəkkəb istəmişdir ki, yazılı surətdə Əlini (ə) canişin kimi təqdim və təsdiq etsin.

Sankt-Peterburq Universitetinin tarix professoru İlya Pavloviç Petruşevski yazır: "Məhəmmədin (s) yetirməsi olan Əli (ə) ona və İslam dininə dərindən bağlı və vəfalı idi. Əli (ə) sadiq və imanlı idi, əxlaqi məsələlərdə çox

diqqətli idi, şöhrətpərəstlikdən, şəhvətpərəstlikdən uzaq idi, şübhəsiz həm döyüşkən idi, həm də şair idi və Allah övliyalarının bütün lazımi sifətləri onda cəmlənmişdir".

Baron Kardova (fransız) Həzrəti-Əlinin (ə) necə bir şücaət və cəsarət sahibi olduğundan söhbət açır və Peyğəmbərin (s) ona bağlılığından danışır: "Əli – o bənzərsiz şücaət sahibi, tayı-bərabəri olmayan qəhrəman və cəsur insan İslam Peyğəmbəri (s) ilə çiyin-çiyinə vuruşur, fəaliyyət göstərir və möcüzəsayağı qiyam edirdi. Bunlar tarixdə şan-şöhrət və əzəmətlə xatırlanır. Əli (ə) "Bədr" döyüşündə iyirmi yaşlı cavan idi. Bir qılınc zərbəsi və qolunun zoru ilə Qüreyiş suvarilərindən olan, özü də güclü və qəhraman sayılan məhşur bir adamı iki böldü.

"Ühüd" döyüşündə Peyğəmbərin (s) qılıncını götürdü, hər bir zərbəsi ilə başları parçaladı, zirehləri yırtdı. Yəhud və Xeybər qalalarına yürüşdə bir əli ilə ağır dəmir darvazanı yerindən qoparıb başı üzərində sipərə çevirdi.

İslam Peyğəmbəri (s) onu çox sevirdi, ona böyük inam və etibarı var idi. Bir dəfə Peyğəmbər (s) nəzərlərini ona dikmiş halda belə söylədi: "Mən hər kim üçün Mövlayamsa, Əli də onun Mövlasıdır!"

*Saqiya, badi-xəzan etsə gülüstanı xərab,*
*Yenə gül nəkhətini zahir elər buyi-gülab.*
*Tutmağa ali-Əli damənini eylə şitab,*
*Bamdən gəlmə, dəri-elmi elə dəqqül-bab*
*Ki, Əli elmi Əlidən olur izhar bu gün.*

(Ey saqi, əgər xəzan yeli çəmənliyi soldursada gülab qoxusu yenidən gülün ətrini aləmə yayar. Odur ki, sən Əli (ə) nəslinin ətəyindən yapışmağa tələs. Dam üstündən aşma, elm şəhərinin qapısını döyərək oraya daxil ol. Ona görə ki, Əli (ə) elmi bu gün Əlinin (ə) özü vasitəsilə ortaya çıxır).

Seyyid Əzim müxəmməsini belə yekunlaşdırır:

*Seyyida, kim ki hürər Şiri-Xuda naibinə,*
*Sən onun lənət oxu ruhuna, həm qalibinə.*
*Qəzəbi-iyzəd onun hazirinə, qaibinə,*
*Baxma dəhrin bu sifət xasirənə, xaibinə.*
*Al qələm, yaz oların həcvinə əşar bu gün.*

(Ey Seyyid, Allahın şirinin naibinə (canişininə) hürənin həm cisminə, həm ruhuna lənət yağdır. Onun yaşayanlarını və ölənlərini Allahın qəzəbi tutsun. Bu zaman sən dünyadakı belə ziyana uğramış və Allahdan ümidi kəsilmiş adamlardan gələcək qorxunu gözə alma. Əlinə qələm götürüb, onları ifşa edəcək şeirlər yazmaqda davam et!).[1]

*****

İmam Sadiqin (ə) şagirdlərindən biri Hişam sünni alimi Əmr ibn Übeyd ilə mübahisə edir ki, Peyğəmbərdən(s) sonra İmam (ə) və rəhbər zəruridir. Hişam belə söyləyir:

[1] S.Ə.Şirvani "Seçilmiş əsərləri" 2-ci cild. Bakı-1969 səh.7.8.9.10.11).

"Cümə günü Bəsrə şəhərinə daxil oldum və məscidə getdim. Əmr ibn Übeyd Mötəzili məsciddə oturmuşdu, böyük bir dəstə də onun ətrafında həlqəvari şəkildə əyləşmişdilər və müxtəlif suallar verirdilər. Mən də məclisin bir tərəfində onların arasında oturdum və üzümü Əmirə tutub soruşdum:

- Ey alim, mən bu şəhərin adamlarından deyiləm. İcazə versəz sizdən bir sual edim?

- Ürəyin nə istəyir soruş.

- Sizin gözünüz varmı?

- Görmürsənmi mənim gözüm var, bunu niyə soruşursan?

- Mənim suallarım bu növdür.

- Soruş, amma sualların faydasızdır.

- Sizin gözünüz varmı?

- Bəli, var.

- Gözlə nə edirsiniz?

- Gözlə görməli şeyləri görürəm, onların rəngini, növünü və sair təyin edirəm.

- Diliniz də varmı?

- Bəli var.

- Onunla nə iş görürsünüz?

- Onunla yeməyin dadını və ləzzətini bilirəm.

- Qoxu və iybilmə hissiniz varmı?

- Bəli var.

- Onunla nə iş görürsünüz?

- Onunla qoxuları duyuram.

- Sizin bunlardan başqa qəlbiniz (və ağlınız) varmı?

- Bəli var.

- Onunla nə edirsiniz?

- Əgər mənim başqa bədən üzvlərim və duyğularım şəkk və tərəddüd edərsə, qəlbim onu aradan qaldırır. Aydındır ki, bəzi hallarda insanın beş hiss duyğusu səhvə yol verir, səhvləri aradan qaldırmaq üçün ağıl və qəlb məhkəməsinə müraciət edirik, bununla onların səhvlərini aşkar edirik".

Hişam deyir: "Elə ki, Əmr İbn Ubeyd bu cümlələri söylədi, mən də onun sözlərini təsdiq etdim və dedim:

"Bəli, Allah insan üzvlərinin və beş duyğu orqanlarının fəaliyyətini istiqamətləndirmək üçün, eyni zamanda onların xəta və səhvlərini aradan qaldırmaq məqsədiylə qəlbi yaratmışdır. Ey alim! Belə söyləsək düzgün olarmı? Tanrı insanın gözünü, qulağını və başqa üzvlərini yolgöstərənsiz yaratmamışdır.

Mehriban Allah Rəsuli-Əkrəmdən (ə) sonra müsəlmanları rəhbərsiz və yolgöstərənsiz qoymuşdursa, nəticədə insanlar şəkk, şübhə, tərəddüd və ixtilaf içində qalmazmı və yoldan çıxmağa, məhvə düçar olmazmı?"

Hişam deyir: "Dedim bir fikirləşib düşünmək lazımdır, hansı sağlam fikir və düşüncə bu mətləbi qəbul edər?" O zaman bu cür sadə suallardan belə bir nəticə ortaya çıxardım. Əmr İbn Ubeyd başa düşdü ki, mən Əhli-beyt (ə) tərəfdarıyam və İmam Sadiqin (ə) tələbələrindənəm. Bu səbəbdən sakit oldu, mənə başqa cavab verə bilmədi. Yalnız bunu bacara bildi ki, xoşagəlimli ümumi sözlər desin və

mübahisəni bitirsin".

Hişam bu mübahisədən belə nəticə çıxarmaq istəyir və qarşı tərəfi başa salmaq istəyir ki, Allah-təala Peyğəmbərdən (s) sonra onun canişini olaraq mütləq rəhbər və başçılar təyin etmişdir ki, bir-birinin ardınca müsəlmanların rəhbəri və başçısı olsun.

Ustad Şəhriyar gözəl demişdir ki:

*Bu olan işdi ki, axşamçağı Allah çobanı*
*Çöldə Allah davarın boşlaya bica başına?*

İslamın adlı-sanlı filosofu Əbu Əli ibn Sina deyir:

"Allah-təala hikmətlidir, insan üçün onun ən kiçicik və zəruri ehtiyacını ödəmək üçün kiprik və qaş yaratmışdır. Belə olduğu təqdirdə ağıl və məntiqə uyarlı olarmı ki, bu qədər mehriban olan Tanrı insanın ən böyük ehtiyacını, yəni ona yolgöstərən təyin etməyi unutsun və bundan qafil olsun, insanı başsız, rəhbərsiz, tərbiyəçisiz və müəllimsiz qoysun, xalqı başlı-başına buraxsın"?

******

Böyük islam müfəssiri və Həzrəti-Əmirəl-möminin Əlinin (ə) xas tələbələrindən olan İbni-Abbas belə nəql edir: “Gecələrin birində Həzrəti-Əli (ə) axşamdan sübhə kimi mənə Quranın “Fatihə” surəsinin “bismillah”ının təfsirini dedi, axırda buyurdu ki, bütün Quran “Fatihə” surəsində cəm olunmuşdur, “Fatihə” surəsi ilə onun “Bislillahir-rahmənir-rahim” kəlməsində, o da “bismillah”ın “bey” hərfinin nöqtəsində cəm olmuşdur, o da mənəm”.

Bey hərfinin nöqtəsi olmadıqda məna vermədiyi kimi, Həzrəti-Əlinin (ə) Allah tərəfindən haqq rəhbər (vəliyy) olmasına inanmayanların da imanı nöqtəsiz bey hərfi kimi naqisdir. Allah-təala isə qiyamətdə naqis imanlıların əməllərini qəbul etməz”.

*Əldə qələm qan ağlar. I c., səh. 66-67.

*****

Böyük alimlərdən biri olan Həsən əl-Qədari Əfəndinin qardaşı oğlu Mirzə Hadi xilafət barəsində əmisinə məktub yazır və xahiş edir ki, Peyğəmbərin (s) həqiqi canişini haqqında ona məlumat versin. Həsən əl-Qədari Əfəndi qardaşı oğlunun xilafət barəsində verdiyi suala şeir dili ilə belə cavab verir:

*Mükərrəm zadeyi-cismil-abadi,*
*Cənabi-nuri-eynim Mirzə Hadi.*
*Səni hifz eyləsin Xəllaqi-aləm,*
*Əbul-ətavanun olsun şadü xürrəm.*
*Pəs, əz iblaqi-təslimati-afir,*
*Olub məlumunuz, ey pakizə xatir.*
*Ki gəldi nameyi-fərxundə halun,*
*Xilafət macərasından sualın.*
*Mühaqa eyləyib təşviri təyin,*
*Bu barədə var əqvali-əssəhhin.*
*Cənabi Mustəfadan sonra əkrəm,*
*Fəqəd Ali-əbadır, ey mükərrəm.*
*İbarətdir olar şiri-Xudadən,*
*İki şahzadədən, Xeyrün-nisadən.*

*Olardı Mustəfanın yadigarı,*
*Kəlamullah ilə hər yerdə cari.*
*Əli ol itrətin şiri-nəridir,*
*Rəsuli ma ədanun sərvəridir.*
*Yetər bürhan ona "Mən küntü mövla".*
*Hüdudinə olmuş mümtaz ol şah.*
*Qəsimi nari vəl cənnə Əlidir,*
*İmamül insi vəl cinnə Əlidir.*
*Əlidən sabiq üç digər xəlifə,*
*Deyillər layiq olsunlar şərifə.*
*Olar ancaq rəsul əshabidirlər.*
*Səhabə Al ilə olmaz bərabər.*
*Oğul xilafət mülki-dünyəvidir,*
*İmamət dində hər surət Əlidir.*
*Ki, axırda imamət ba xilafət,*
*Onun üstündə tapdı istiqamət...*

*****

Bir gün Qazi Əbdülcəbbar Bağdadda şiə və sünni alimlərindən təşkil olunmuş məclisin başında əyləşmişdi. Bu zaman Şeyx Mufid (o zamanlar ona Şeyx Mufid deyilmirdi) məclisə daxil olub məclisin aşağı hissəsində əyləşir. Bir qədər keçdikdən sonra üzünü Qaziyə tutub deyir:

- Mənim bu alimlərin hüzurunda sənə bir sualım var. Peyğəmbərin (s) Qədir-Xumda dediyi bu hədis barəsində fikriniz nədir: "Mən kimin ağası və rəhbəriyəmsə, Əli (ə) da onun ağası və rəhbəridir". Bu hədis düzgündürmü?

- Bəli, düzgündür.

- Bəs onda şiə və sünnilər arasında ədavət və fikir ayrılığı nədir?

- Bu hədis rəvayətdir. Amma Əbu-Bəkrin xilafəti dirayətdir. (ictihadın görünüb, elm və məlumat üzündən olması).

Ədalətli insan rəvayəti (xəbəri) dirayətlə (görməklə) tay tutmaz. Çünki dirayət rəvayətdən üstündür.

Şeyx Mufid deyir:

- Siz Peyğəmbərin (s) Əliyə (ə) dediyi bu söz barəsində nə deyirsiniz: "Səninlə müharibə mənimlə müharibə, səninlə sülh mənimlə sülhdür".

Qazi:

- Bu hədis səhihdir.

- Sizin "Cəməl" səhabələri (Təlhə, Zübeyr və sair) ba-

rəsində nəzəriniz nədir?

- Sonradan onlar tövbə etdilər.

- Onların müharibəsi dirayət (görmək və elm) üzündən olmuşdur. Amma tövbə etmələri rəvayətdir. Qədir-Xum hədisi barəsində isə dediniz ki, rəvayət dirayətlə bərabər deyil, bəlkə dirayət üstündür.

Qazi Şeyx Mufidin sualı qarşısında aciz qalıb, başını aşağı salır və soruşur:

- Sən kimsən?

Şeyx Mufid cavab verir:

- Mən Mühəmməd ibn Mühəmməd ibn Nömani Harisəm.

Qazi taxtından durub Şeyx Mufidin əlindən tutaraq öz yerində əyləşdirir və deyir:

- Əntəl mufidu həqqa (şübhəsiz sən mufid (faydalı, xeyirli) bir insansan).

Məclisdəkilər bu işdən narahat olsalar da, qazi üzünü onlara tutub söyləyir: "Bu kişi mənə bir sual verdi, mən onun cavabında aciz qaldım. Əgər sizlərdən hər hansı biriniz onun cavabını verə bilsə, qazilik taxtında o əyləşəcəkdir". Ordakılardan heç kəs cavab verməyib susurlar.

Bu hadisə bütün yerlərə yayıldı. Elə həmin gündən də İbn Nomani Harisi Şeyx Müfid adı ilə səslədilər.[1]

*Eyləmiş xətmi-Peyğəmbər Qədri-Xumda çün bəyan*

---

[1] Molla Əliheydər Naqis Tazəkəndi "İbrətə layiq olanlar", səh.237-239

*"Siz bilin məndən sora, Mövla Əlidir, şiəyan!*
*Həm Həsən, həm də Hüseynin bu cahanda parlayan*
*Mənbəi-nuri-qidası ya Əliyyəl-Mürtəza.*

*****

Həzrəti-Peyğəmbər (s) buyurub: "Ümmətimin alimləri ulduzlar kimidir". Belə ulduz alimlərdən biri də mərhum Müqəddəs Ərdəbili olub. Deyirlər ki, müqəddəs Ərdəbilinin vəfatından sonra müctəhidlərdən biri yuxuda görür ki, Müqəddəs Ərdəbili böyük alimlərin və səhabələrin cərgəsində Həzrəti-Əlinin (ə) hərəmini gəzir. Həmin adam yuxuda Müqəddəsdən soruşur: "Belə uca məqama necə və nə yolla çatmısan?"

Müqəddəs Ərdəbili cavab verir: "Mənim bu məqama yetməyimin səbəbi Həzrəti-Əlini (ə) sevməyim və onun İmamlığını qəbul etməyim oldu".

*Ey dil, yapiş ol Əhməldi-Muxtar ətəyindən,*
*Ta kim nəfəsin var.*
*Səflər dağıdan Heydəri-Kərrar ətəyindən,*
*Qəmdən bizi qurtar.*
*Tut silsileyi-seyyidi-əbrar ətəyindən,*
*Onlardu dəhü çar.*[1]
*Həftad du tən yavəri qəmxar ətəyindən,*
*Xoşxülq, xoşətvar.*

[1] Dəhu-çar - 14 məsum, həftadu-tən - 72 yavər (Kərbəla şəhidləri)

Qasım bəy Zakir bu şeirində vurğulayır ki, insanların bu dünyada və axirətdə səadətə, xoşbəxtliyə çatması üçün yeganə düzgün yol 14 məsumun ətəyindən tutmaları və 72 Kərbəla şəhidlərindən ibrət almalarındadır. Allah-təala bizi doğru yolun yolçularından qərar versin. Amin!

## SƏQİFƏ (SÜQEYFƏ) CƏRƏYANI

1500 il öncə yaşanan bir fitnəni Bağımsız Türkiyə partisi gənəl başkanı prof. Haydar Baş aydınlatıyor. Allahın emri ile ve peygemberimizin tekliyine rağmen İmam Ali (ə) efendimizin halifelik haqqı Sakifede oylama yolu ile Hezreti-Ebu-Bekire keçdi. Bu olayi islam tarixində Ilk fitne ateşi olarak yorumlayan btp lideri sünnelik deyə bir yol olmadığını tək haqq yolun Ehli-Beyt (ə) olduğunu vurğuladı: "İslam tarixində ilk fitnənin Cəməl və Siffein döyüşlərində çıxıb-çıxmadığı soruşulur?

İslam tarixinin ilk fitnəsi, hələ Rəsulullahın (s) vəfatı zamanı Sakifədə baş vermiş "oldu bitti"dir. Hezrəti-Əli (ə) və bir neçə səhabə Hezrəti-Peyğəmbərin (s) cənazəsi ilə məşğul olarkən aralarında Hezrəti-Əbubəkir və Həzrəti-Ömərin də olduğu az bir səhabə topluluğu Sakifə deyilən yerdə xəlifəni rəyləri ilə seçmişdilər. İlk fitnə alovu da burdan başlanılır. Rəsulullahın (s) rihletinden çok kisa bir süre önce Gadir mevkiinde Hezrəti-Əli (ə) halife ve yerine vasi olarak atadığını bilen başta Hezrəti-Ebubekir ve Hezreti-Ömer olmak üzere bu sahabeler emre uymamış, duyduklarını inkar etmiş ve kendi aralarında Hezreti-Əlinin (ə) dışında bir halife seçmişlerdir. Altının çizilmesi gereken husus, İslamda halifeliğin ümmet reyi ile belirlenmeyeciyi konusudur. Halifenin seçimi nasp iledir. Cenabı

Hakkın emri ile işaret edilir ve Resulunun (s) sünneti ile seçim gerçekleşir. İmamı seçen ve işaret eden Allah ve Resuludur (s). Nitekim Hezreti-Əlinin (ə) imam olarak tayini aynen bu şekilde olmuştur. Ne Hazreti-Ebubekrde ne de Hezreti-Ömerde, ne de Hezrəti-Osmanda Cənabı Hakkın işarəti ve Resulullahın (s) halife olmaları yönünde bir nasp söz konusu değildir. Sakifeden sonra, imamet ve hilafet makamı bir-birinden ayrılmıştır. İmamet Hezreti-Peyğembərin (s) hədislərində beyan buyurduğu, Ehli-Beytin (ə) yolundan gelen Hz.Alinin (ə) Evlatlarının hakkıdır. Hilafet ise bir koltuk sevdası şeklinde devletin başına geçme hevesi olarak farklı kişilerin elinde adeta bir topa dönüşmüşdür.

220 Sünni alimin eserinde yer alan ve hiç bir şüpheye yer bırakmmayacak açıklıktaki Gadir-Hum konusu, İmamet ilanıdır ve Ehli-Beyt (ə) dünyası için bir İmam şartıdır. Sünni ulemadan Hafiz Ebu Cafer Muhammed b. Cerir-l Taberi, “El Velayetu Fi Turuk-i Hadis-il Gadir” adlı kitabında Gadr hadisini Zeyd b. Erkam’dan şöyle revayet ediyor: “Resulullah (s) “Veda Haccı”ndan dönerken öğle vaktinin sıcağında Gadir-Hum denen yerde durdu. Büyük gölgelikler kurulmasını emretti. Gölgelikler kurulduktan sonra herkesin cemaat namazı için toplanmasını buyurdu. Cemaat namazı için toplandık; Allah Resulü (s) bizlere bir hütbe okuyarak şöyle buyurdu “Allahu-Teala bana şu ayeti nazil etti: “Ey Resul! Sana indirileni tebliğ et . Eğer bunu yapmazsan peygamberliğini tebliğ etmemiş gibi olur-

sun. Allah seni insanlardan koruyacaqdır.

******

Əbubəkrin atası onun xilafətə seçildiyini eşidəndə təəccüblə soruşdu: “Bəs Peyğəmbərin vəsiyyətinə nə üçün əməl olunmadı və əli ilə beyət edilmədi?”. Cavab verdilər ki, Əli çox cavanır, Əbubəkr isə yaşlıdır, təcrübəlidir. Əbubəkrin atası dedi: “Əgər yaşlılıq əsas götürülürsə, onda mən bu vəzifəyə oğlumdan daha artıq layiqəm!” (Və ömrünün sonuna kimi oğluna beyət etmədi.)... Beləliklə, haqqın tapdalanmasının ilkin əsas əlamətləri aşkar olmağa başladı. Həzrəti-Əli (ə) dəfələrlə Peyğəmbərin Ğədir-Xumdakı vəsiyyətini xatırlatmaq, camaatı ayıltmaq istəyirdi, amma onlar elə dərin ğəflət yuxusuna getmişdilər ki, onun sözünü təsdiqləyən yalnız 2-3 nəfər oldu, üstəlik 25 il səbr edəndən sonra camaatın israrı ilə xilafətə gələndə, ayişənin əmri ilə (Cəməl vuruşunda) yüz minlərlə adam onun qanını tökməyə can atırdı. Sonra Əbubəkr xilafət kürsüsündə yerini bərkitmək üçün beyət etmək istəməyənlərdən zorla beyət almaq qərarına gəldi. Bu işə etiraz əlaməti olaraq başda Həzrəti-Əli olmaqla bir neçə nəfər Həzrəti-Fatimənin evinə yığışdılar. Lakin Əbubəkrin göndərdiyi məmurlar onları zorla çıxardıb beyətə aparmaq istədilər. Ömər qapı arxasında dayanıb kobud səslə Fatiməni (s.ə) hədələdi: “Qapını açmasan yandıraram!” Dedilər ki, axı içəridə Fatimə var! “Hətta Fatimə olsa!” deyə cavab verdi, sonra Qonfizə əmr etdi  ki, qapını yandırsın”. (Əldə qələm qan ağlar . I c., səh. 13-14).

******

Azərbaycan klassik ədəbiyyatı tarixində 19-cu əsrin görkəmli şairi, şirinkəlam H.M.Təqi Qumri Dərbəndi milli mədəniyyətimizi öz bənzərsiz şeirləri, o cümlədən qəsidələri, mərsiyə, mənzumə və növhələri ilə bəzəyən qüdrətli sənətkardır.

Onun «Kənzül-Məsaib» əsərində cənab «Xətəməl-Ənbiyanın (s) ölümündən sonra xilafətin qəsb edilməsi xüsusunda hadisələrin səbəbi» bölümündə Süqeyfə cərəyanının necə meydana gəlməsini belə nəql edir:

Çün pərçəm açdı rəyəti-tüğyan Süqeyfədə,
Oldu sitəmlə din evi viran, Süqeyfədə.
Amadə qıldı samiri ol ümməti-rəsul,
Gəvsaləvar bərxizi –nadan Süqeyfədə.
Açmaqlığa təriqilə küfrü zəlaləti,
Əvvəl qılıb müsafihə şeytan, Süqeyfədə.
İsbati –fəzli- Heydəri inkar qılmağa,
Gizlətdilər çox ayeyi –Quran, Süqeyfədə.
Gəldi zühurə batilü həqq oldu payimal,
Göz yaşlı qaldı Büzəru-Səlman, Süqeyfədə.
Dəfn etməmiş rəsuli-xudanın cənazəsin,
Qopdu xilafət üstə nə tufan, Süqeyfədə.
Çox sinalərdə şöləl期nib nari-irtidar,
Etdi biruz kineyi-pünhan, Süqeyfədə.
Yandırmağa rəsuli-xuda bargahini,

Təyin olundu atəşi – suzan, Süqeyfədə.
Bir növ ilən alışdı onun pür şərarəsi,
Kərbübəladən oldu nümayan, Süqeyfədə.
Tapdı şikəst dəndeyi-pəhluyi-Fatimə,
Ol zülmdən ki, etdilə bünyan, Süqeyfədə.
Səqt oldu Möhsün ağladı qan xeyrətün-nisa,
Çıxdı sədayi-naləvü əfğan, Süqeyfədə.
Mehrab içində tiği-cəfa ilə qıldılar,
Şiri-Xudanı qaninə qəltan, Süqeyfədə.
Doğrandı Müctəba cigəri zəhri-kinilən,
Tabuti-nəşin oxladı üdvan, Süqeyfədə.
Abi-Fərati bağladlar ali- Heydərə,
Qaldı Səkinə ləbləri ətşan, Süqeyfədə.
Tiği sitəmlə kəsdilə Əbbas qolların,
Cismin yaralı qoydular üryan, Süqeyfədə.
Xəncərlərilə doğradılar teşnə Əkbəri,
Qasim otağın etdilər viran, Süqeyfədə.
Qundaq içində eylədilər hülqi-Əsğəri,
Rəhm etməyib nişaneyi-peykan, Süqeyfədə.
Yetmiş iki cəvan bədəni xaki-xunara,
Düşdü yaralı qan ilə əlvan, Süqeyfədə.
Sultani- Kərbəla başını kəsdilər susuz,
Bu məkrilən Ömər dəxi üdvan, Süqeyfədə.
Gəzdirdilər əsir qılıb bağlı qolları,
Ali-rəsuli-zülfi-pərişan, Süqeyfədə.
Zeynül-İbadi Baqir ilən oğlu Cəfəri,
Zəhrilə qıldılar cigəri qan, Süqeyfədə.
Zəncirə bağlı həzrəti-Musayə on bir il,

Mənzil verildi guşeyi-zindan, Süqeyfədə.
Can verdi zillətlə quru yerdə sinə dağ,
Şahi –qərib xaki-Xorasan, Süqeyfədə.
Ənvari –həqq Təqiyü Nəqiyy oldular şəhid,
Həm Əsgəri o mədini-ehsan, Süqeyfədə.
Bir vəqt olur zühur qılar sahibi-Zaman,
Eylər qisas almağa divan, Süqeyfədə.
Tökdü təhiyyə vurmaq üçün od əbuşşərur,
Qumrini qıldı sinəsi suzan, Süqeyfədə.[1]

Doktor Taha Hüseyn "Əli (ə) və onun övladları" kitabında acizliklə etiraf edir: "İslam dininin hakimiyyətə aid sözü yoxdur. Çünki birinci xəlifəni (Əbu Bəkr) müsəlmanlar ümumi səslə seçdilər, ikincisi (Ömər) vəsiyyətlə xəlifə oldu, üçüncüsü (Osman) altı nəfərlik şura üzvlərinin səs verməsi yolu ilə seçildi, dördüncüsü (Əli (ə)) müsəlmanların ümumi səsverməsi yolu ilə seçildi. "...Hicrətin qırx birinci ilindən sonra hakimiyyət, xilafət modelindən krallığa çevrildi. Belə ki, Hicrətin 132-ci ilinə qədər Bəni-Üməyyə tayfasının cavanları arasında uşaq oyuncağı kimi əldən-ələ düşdü. Daha sonra, Hicrətin 650-ci ilinə qədər Abbasilər hakimiyyət başında oldular. Bunların hansı düzgün İslam yolu imiş?"[2]

---

[1] Qumri Dərbəndi. Kənzül-Məsaib. Bakı-1999, səh. 87-88)

[2] Bir neçə il bundan öncə həyatını sona çatdırmış mərhum doktor Taha Hüseyn Misirdə yaşamış böyük yazıçı və görkəmli tarixçi

***

Ömrünün böyük bir hissəsini haqq və ədalət yolunda mübarizəyə sərf edən və Həzrəti-Əlinin (ə) vilayəti barədə "Əl-ğədir" (XI cild ) kitabının müəliffi mərhum Əllamə Əminini Bağdadda yaşayan bir dəstə sünni alimləri təkidlə elmi mübahisəyə dəvət edirlər. Lakin Əllamə Əmini onların təklifini qəbul etmir. Çox təkiddən sonra Əllamə yalnız şam yeməyinə gələcəyini söyləyir. Onlar da qəbul edir ki, bir təhər bəhs edərik. Həmin məclisdə də təxminən 70-80 nəfər hədis hafizi olur. Əllamə şam yeməyinə gedir və şam qurtarır, qayıtmaq istəyəndə alimlər Əllaməni elmi bəhsə dəvət edirlər. Əllamə şərti alimlərin yadlarına salır. Alimlər əlacsız qalıb deyirlər ki, yaxşı hərə bir hədis desin və məclisimiz nurani olsun. Hamı hədis deyir bir-bir və növbə Əlləməyə çatır. Əllamə Əmini deyir: "Bir şərtlə hədis deyərəm ki, hamı bu hədisin sənədinin yerini desin". Məclisdə olan alimlərin hamısı hədis hafizi olduğu üçün Əllamənin hədisini sənədi ilə təsdiqləyirlər. Hədis belədir: "Hər kəs zəmanəsinin İmamını tanımadan ölsə cahil kimi dünyadan köçər". Əllamə Əmini bu hədisi dedikdən sonra məclisdə olan alimlərdən soruşur: "Sizcə xanım Fatimeyi-Zəhra (s.ə) dünyadan imanla köçdü ya cahil kimi?" Məclisdə olan bütün alimlər bu sualın qarşısında aciz qalıb məclisi tərk etdilər. Çünki hər iki cavabda batil olmaqları üzə çıxacaqdır. Birincisi budur

---

alimdir. İllər boyu "əl-Həram" qəzetinin redaktoru və Milli Məclisin üzvü olmuşdur.

ki, desəydilər cahil kimi dünyadan gedib buna cürət edə bilməzdilər. Çünki Xanım Fatimeyi-Zəhra (s.ə) (Seyyidətul-Nisail-Aləmindi-iki dünya xanımlarının ağasıdır). İkincisi budur ki, desəydilər Xanım Fatimeyi-Zəhra (s.ə) imanla dünyadan köçüb, onda Əbu Bəkrin xilafəti batildir. Çünki xanım Fatimeyi-Zəhra(s.ə) Əbu Bəkrə beyət etmədən dünyasını dəyişmişdir.

"Əl-Ğədir" kitabının müəllifi mərhum Əllamə Əminin məzhəb alimlərinə həqiqəti çatdırmaq istəyərkən Səqifənin batil olduğu üzə çıxır.

## CANİŞİN TƏYİN OLUNMASI, YAXUD QƏDİR-XUM HADİSƏSİ BARƏDƏ

Şəkk yoxdur ki, İslam dini ilahi dinlərin sonuncusudur. Nə qədər ki, Rəsuli-Əkrəm sağ idi, cəmiyyətə rəhbərlik etmək onun öhdəsində idi. Onun vəfatından sonra isə cəmiyyətə rəhbərlik etmət ümmət içərisində ən ləyaqətli şəxsə tapşırılmalı idi. Peyğəmbərdən sonra ümmət rəhbərinin Allah tərəfindən təyin edilməsi, yaxud seçki yolu ilə olması barədə iki nəzəriyyə mövcuddur. Şiələrin etiqadına görə, ümmətə rəhbərlik məqamı, yəni Peyğəmbərin canişini Allah tərəfindən təyin olunmalıdır; amma sünnilərin etiqadına görə, bu məqam seçki yolu ilə olan bir məqamdır və ümmət Peyğəmbərin vəfatından sonra bir nəfəri ölkəni idarə etmək üçün seçməlidir. Bu iki firqədən hər biri öz nəzəriyyələrini isbat etmək üçün müəyyən dəlillər gətirmişlər və bu dəlillər kəlam elmindən bəhs edən kitablarda təfsilatı ilə qeyd olunmuşdur. Amma risalət dövrünə hakim olan ictimai şəraiti dəqiq şəkildə təhlil eydikdən sonra bu nəzəriyyələrdən sonra hansının düzgün olduğunu görmək olar.

Peyğəmbər dövründə İslamın daxili və xarici siyasətlərinin araşdırılması göstərir ki, o Həzrətin canişini Allah tərəfindən təyin edilməli, Peyğəmbər tərəfindən camaata təqdim edilməlidir. Çünki İslam cəmiyyəti o vaxt ardıcıl

olaraq üç nahiyədən: Roma, İran imperatorluqları və daxildəki münafiqlər tərəfindən müharibə, cəmiyyətə ixtilaf salınması ilə hədələnirdi. Ümmətin məsləhəti və mənafeyi tələb edirdi ki, Peyğəmbər siyasi bir rəhbər təyin etməklə ümməti xarici və daxili düşmənlərin qarşısında vaqhid bir cəbhədə birləşdirsin, düşmənin içərilərə nüfuz edib onlara hakim olması təhlükəsini aradan qaldırsın. Bu xətərli üçlüyün bir tərəfini Roma imperatorluğu təşkil edirdi ki, bu böyük və qüdrətli dövlət Ərəbistan yarımadasının şimal tərəfində yerləşirdi və həmişə Peyğəmbəri məhv etmək haqqında fikirləşirdi. Roma məsələsi də o Həzrətin həyatının son anlarına qədər onun diqqət mərkəzində idi. Müsəlmanların Roma ordusu ilə ilk dəfə qarşılaşdığı vaxt (Fələstində, hicrətin 8-ci ilində) Cəfəri Təyyar, Zeyd ibni-Harisə. Əbdüllah ibni-Rəvahə kimi böyük sərkərdələr şəhadətə yetişmiş, İslam Ordusu gözlənilmədən məğlubiyyətə düçar olmuşdu.

İslam ordusunun kafirlər qarşısında geri çəkilməsi Qeysər ordusunun cürətlənməsinə səbəb olmuşdu; hər an İslam mərkəzinin qeysər tərəfindən hücumlara məruz qalması gözlənilirdi. Bu cəhətdən, Peyğəmbər (s) 9-cu hicri ilində hər hansı toqquşmada qoşuna rəhbərlik etsin deyə, böyük bir ordu ilə Şam sərhədlərinə doğru hərəkət etdi. Başdan-ayağa əzab-əziyyətlə, məşəqqətlə dolu olan bu səfərdə İslam ordusu öz keçmiş heysiyyətini geri qaytara, öz siyasi həyatını təzələyə bildi. O, xəstəliyindən bir neçə gün əvvəl, İslam ordusunu Üsamənin rəhbərliyi ilə Şam

sərhədlərinə göndərdi.

İkinci düşmən İran imperatorluğu idi. Belə ki, İran şahı Xosrov Peyğəmbərin göndərdiyi məktubdan qəzəblənmiş və onu cırmış, o Həzrətin (s) elçisini təhqirlə çölə salmış, üstəlik Yəmən hakiminə yazmışdı ki, Peyğəmbəri (s) tutsun, imtina etdiyi surətdə isə öldürsün. Xosrov Pərvizin Peyğəmbər (s) zamanında dünyadan getməsinə baxmayaraq, Yəmənin istiqlaliyyət məsələsi (o uzun müddət İran dövlətinin müstəmləkəsi olmuşdu) İran şahlarının nəzərindən yayınmırdı və lovğalıq İran siyasətçilərinə heç vaxt icazə verməzdi ki, belə bir qüdrətin (İslamın) varlığına dözsünlər.

Üçüncü təhlükə münafiqlər idi. Onlar müsəlmanların arasında casusluqla, təxribatçılıqla məşğul idilər. Hətta bəzi vaxtlar (Təbukdan Mədinəyə qayıdanda) Peyğəmbərə sui-qəsd hazırlamışdılar. Onların bəziləri zümzümə edib deyirdilər ki, Peyğəmbərin (s) ölümü ilə İslam inqilabı sona yetəcək, beləliklə də hamılıqla rahat olacaqlar (Tur surəsi, 30-cu ayə).

Peyğəmbərin (s) vəfatından sonra Əbusüfyan cəmiyyətə qarışıqlıq salmaq üçün bir hiyləyə əl atdı: Həzrəti-Əli ilə beyət etmək. Nəticədə müsəlmanları iki cinaha ayırıb bir-birinin canına salmaq istədi. Əli (ə) xas bir ayıqlıqla onun murdar niyyətindən agah oldu, sözlərini rədd edib dedi: “Allaha and olsun, sənin fitnə-fəsad salmaqdan başqa bir məqsədin yoxdur. Sən təkcə bu gün deyil, dəfələrlə şər, fitnə törətmək istəmisən. Mənim sənə heç bir ehtiyacım yoxdur” (İbni-Əsir. Kamil. II c., səh. 220; İqdül-fərid.

II c., səh. 249).

Münafiqlərin təxribatçılıq işləri güclü idi və Ali-İmran, Nisa, Maidə, Ənfal, Tövbə, Ənkəbut, Əhzab, Mühəmməd, Fəth, Hədid, Münafiqun və Həşr surələrində qeyd olunmuşdur. Görəsən, İslamı məhv etmək üçün pusquda durmuş belə qüdrətli düşmənlərin mövcudluğu ilə belə, Peyğəmbərin (s) yenicə qurulmuş İslam cəmiyyətində siyasi və dini işlərə rəhbərlik etmək üçün rəhbər təyin etməməsi düzgün iş sayılardımı? İctimai hesablamalar hökm edir ki, Peyğəmbər (s) özündən sonra rəhbər təyin etməklə vəfatından sonra yaranacaq ixtilafların qarşısını almalı, möhkəm bir müdafiə xətti yaratmaqla islamın vəhdətini təmin etməli idi. Peyğəmbərdən (s) sonra hər hansı xoşagəlməz hadisənin, İslam rəhbərinin hansı tayfa və qəbilədən olacağı barədə ixtilafın büruz etməsinin qarşısını almaq üçün yalnız o Həzrət (s) tərəfindən bir rəhbərin təyin olunması vacibdir.

Bu ictimai hesablamalar, Peyğəmbərdən sonra rəhbərlik məqamənən Allah tərəfindən olması nəzəriyyəsinin mətinliyini, düzgünlüyünü göstərir. Məhz bu kimi səbəblər üzündən Peyğəmbər (s) həcc fərizəsini yerinə yetirdikdən sonra, Mədinə yolunda, Rabiğ məntəqəsindəki Cöhfə adlı bir yerdə ən böyük vəzifəsini yerinə yetirmək üçün məmur olundu. Cəbrəil Ğədir-Xum adlı bir yerdə nazil oldu, Maidə surəsinin 67-ci ayəsi ilə ona xitab etdi: "Allah tərəfindən sənə nazil olanı (Həzrəti-Əlinin canişinlik məsələsini) camaata çatdır! Əgər çatdırmasan, öz risalətini yerinə ye-

tirməmisən. Allah səni camaatın yetirə biləcəyi zərərlərdən amanda saxlayacaq”.

Ayənin ləhni (tonu) göstərirdi ki, Allah-təbarək və təala çox böyük, ağır, məs’uliyyətli bir işin görülməsini Peyğəmbərin (s) öhdəsinə qoymuşdu. Peyğəmbər (s) əmr etdi ki, karvan dayansın, arxadakılar da gəlib çatsınlar. Karvanın dayanması barədə fərman o vaxt verildi ki, hava şiddətlə qızmışdı, camaat əbalarının bir hissəsini yerə sərmiş, bir hissəsini başlarına atmışdılar. Peyğəmbər (s) üçün bir kölgəlik düzəltdilər, zöhr namazını onlar ilə birlikdə qıldı, sonra dəvələrin palanlarından düzəldilmiş hündür bir yerə qalxıb uca səslə aşağıdakı xütbəni oxudu: Həmd və səna Allaha məxsusdur. Ondan kömək istəyir, Ona iman gətirir və Ona təvəkkül edirik. Öz pisliklərimizdən, nalayiq əməllərimizdən ona pənah aparırıq. Elə bir Allah ki, Ondan başqa yolgöstərən, hidayət edən yoxdur. O, hər kəsi hidayət etsə, onu bir daha zəlalətə salan olmaz. Şəhadət verirəm ki, Ondan başqa heç bir məbud yoxdur. Mühəmməd Onun bəndəsi və rəsuludur. Ey camaat, Xəbir və Lətif olan Allah mənə xəbər vermişdir ki, yaxın zamanlarda Onun dəvətinə “ləbbeyk” deyib, sizin aranızdan gedəcəyəm. Mən də cavabdehəm, siz də cavabdehsiniz. Mənim barəmdə nə deyirsiniz?

Peyğəmbərin dostları: “Şəhadət veririk ki, sən Allah dinini təbliğ etmisən və bizim barəmizdə xeyirxahlıq, səy və təlaş etmisən. Allah Sənə yaxşı mükafat versin” deyə cavab verdilər.

Elə ki, sükut cəmiyyəti bürüdü. Peyğəmbər (s) buyurdu:

"Şəhadət verirsinizmi ki, Allahdan başqa bir məbud yoxdur, Mühəmməd onun bəndəsi və peyğəmbəridir, ölüm, behişt və cəhənnəm haqdır, Qiyamət günü gəlib çatacaq. Allah təbarək və təala yerin altında gizlənənləri dirildəcək?

Peyğəmbərin dostları: "Bəli, şəhadət veririk" deyə cavab verdilər.

Həzrət (s) buyurdu: "Mən sizin aranızda iki ağır və böyük şeyi əmanət olaraq yadigar qoyuram, onlarla necə rəftar edəcəksiniz?

Bir nəfər soruşdu: "Bu böyük əmanət dedikdə, məqsəd nədir?"

Peyğəmbər (s) buyurdu: "Siqli-əkbər" Allahın kitabıdır; onun bir tərəfi Allaha bağlıdır, digər tərəfi isə sizin əlinizdədir. Allah kitabından yapışın, zəlalətə düşməyəsiz. "Siqli-əsğər" mənim Əhli-beytim və itrətimdir. Allahım mənə xəbər vermişdir ki, mənim yadigar qoyduğum bu iki şey Qiyamət gününə kimi heç vaxt bir-birindən ayrılmayacaqdır. Ey camaat, Allahın kitabından və mənim itrətimdən qabağa keçməyin və bu ikisindən geri də qalmayın, əks halda məhv olarsınız".

Bu vaxt Peyğəmbər (s) Həzrəti-Əlinin (ə) əlindən tutub yuxarı qaldırdı, hamı Əlini (ə) Peyğəmbərin (s) yanında gördülər və başa düşdülər ki, onların bura yığılmasında əsas məqsəd Əliyə (ə) aid olan bir məsələdir. Peyğəmbər (s) buyurdu: "Ey camaat, möminlərə (ixtiyar sahibi olmaqda) onların özlərindən daha layiqli olan kimdir?"

Peyğəmbərin (s) ətrafındakılar "Allah və Onun Pey-

ğəmbəri (s) daha yaxşı bilərlər" deyə cavab verdilər.

Peyğəmbər (s) buyurdu: "Allah mənim mövlam (ixtiyar sahibim), mən də möminlərin mövlasıyam və (onların özləri barədə) onların özlərindən də artıq ixtiyar sahibiyəm. Ey camaat, mən hər kəsin mövlası (ixtiyar sahibi) və rəhbəriyəmsə, Əli də onun mövlası və rəhbəridir".

Sonra bu sözləri üç dəfə təkrar etdi. (Əhməd Hənbəldən nəql olunan rəvayətə görə, Peyğəmbər bu cümləni dörd dəfə təkrar etdi.) Sonra dedi: "İlahi, Əlini sevən hər kəsi Sən də sev, Əli ilə düşmənçilik edənlə düşmən ol! İlahi, əlinin dostlarına kömək et, düşmənlərini xar və zəlil et! İlahi, Əlini haqqın mehvəri qərar ver".

Peyğəmbəri-əkrəm (s) bu sözləri buyurub, əlavə etdi ki, burada olanlar (bu xəbəri) burada olmayanlara xəbər versilər, onları da bu hadisədən agah etsinlər.

Hələ Ğədir-Xumdakı təntənəli yığıncaq dağılmamışdı ki, vəhy mələyi nazil olub Peyğəmbərə (s) müjdə verdi ki, "Allah bu gün sənin dinini kamil etdi, Öz nemətini imanlılara bol etdi" (Maidə surəsi, 3-cü ayə). Bu vaxt Peyğəmbərin (s) təkbir səsi ucaldı və buyurdu: "Allaha şükür edirəm ki, Öz dinini kamil etdi, Öz nemətini tamamladı və mənim risalətimdən, Əlinin vilayətindən (rəhbərliyindən) xoşhal oldu".

Bunları deyib dayandığı yerdən aşağı endi. Peyğəmbərin (s) dostları dəstə-dəstə Əliyə (ə) yaxınlaşıb onu təbrik edərək, hər bir imanlı insanın rəhbəri hesab edirdilər.

Həssan ibni-Sabit Peyğəmbər (s) dövrünün şairlərindən biri idi. O, bu tarixi hadisəni nəzmə çəkərək əbədiyyət

rəngi ilə boyadı. Şeirin məzmunu belə idi: "Peyğəmbər (s) Əliyə (ə) buyurdu ki, qalx, mən səni özümdən sonra camaata rəhbər, yolgöstərən seçdim. Mən hər kəsin rəhbəriyəmsə, Əli də onun rəhbəridir. Camaat, sizə vacibdir ki, Əlinin həqiqi dostlarından, həqiqi ardıcıllarından olasınız".

Bunlar hamısı, sənədləri İslam alimləri tərəfindən mötəbər sayılan hədislərdə qeyd olunan bir hadisədir. Ğədir-Xum hadisəsi əbədi və həmişəyaşar bir hadisədir. Təfsirçilər bu hadisə ilə əlaqədar olan iki ayəni (Maidə surəsinin 3-cü və 67-ci ayəsini) təfsir edərkən, hədisçilər bu hadisə barədə Peyğəmbərin (s) sözünü nəql edərkən, kəlam alimləri isə bu hadisənin imamət və rəhbərlik məsələsi ilə əlaqədar olduğuna görə bu barədə müəyyən sözlər demişlər. Tarix kitablarının çoxunda bu tarixi hadisə müxtəlif adlar altında araşdırılmışdır.

Tarixdən məlum olur ki, bu hadisə (zilhiccənin 17-si) müsəlmanlar arasında "Ğədir-Xum" bayramı kimi tanınmışdır. İbni-Xəlkan "Əl-müstə'la billah" barəsində yazır: "...487-ci ildə Ğədir-Xum bayramı günündə (17-si zilhiccə) camaat onunla beyət etdi".

Həmçinin "Əl-müstənsirü billah" barəsində yazır: "...o, 487-ci ildə (zilhiccənin axırına 12 gün qalmış) vəfat etdi və bu gecə, yəni zilhiccənin 17-si Ğədir-Xum bayramıdır".*

Əbu Reyhan Biruni Ğədir-Xum bayramını bütün müsəlmanlar tərəfindən qeyd olunan bayramlar sırasına daxil etmişdir. Ğədir-Xum hədisi istər səhabə, istər tabein, istər-

sə də sonrakı əsrlərdə yaşayan alimlırin dövründə (bütün əsrlərdə) çox məşhur hədislərdən sayılırdı. Heç bir tədqiqatçı onun sənədlərinin doğruluğunda və əsalətində şəkk edə bilməz.

Ayətullah Cəfər Sübhani. “İslam tarixi., səh. 305-312.

*Məkana görə tarix 1 gün dəyişilə bilir.

## "QƏDİR-XUM"UN QISA XRONİKASI

Qədir-Xum –Zilhiccə ayının 18-i, günlərin ən qədirlisi, ən əfzəli, ən şərafətlisidir.

Qədir-Xum – İslamın ən əziz və ən böyük bayramıdır.

Qədir-Xum – Vilayət günü, həm də vilayət gününün şanlı viladətidir.

Qədir-Xum – Məkkə ilə Mədinə arasında yerləşən müqəddəs məkanlardan biridir.

Qədir-Xum – İlahi vəhyin, ilahi əmrin peyğəmbər tərəfindən elan olunan məntəqənin adıdır.

Qədir-Xum – Həccül-vidanın şahidi və daha doğrusu o günün tarixidir.

Qədir-Xum – İmam Əlinin (ə) Allah tərəfindən imamətə və vilayətə təyinatıdır.

Qədir-Xum – Cənab Cəbrailin "təbliq" ayəsi ilə peyğəmbərə müjdə gətirməsidir.

Qədir-Xum – Haqq-təala tərəfindən dinin kamil olması, nemətlərin tamamlanması və Haqqın İslamdan razılığıdır.

Qədir-Xum – Əli ibn Əbu Talibdir.

Qədir-Xum – Şahi-vilayətin mövla, yəni rəhbər təyin olunmasıdır.

Qədir-Xum – Bütün İslamın təntənəsidir.

Qədir-Xum – Haqq təala tərəfindən əmr olunan vəhdət meyarıdır.

Qədir-Xum – Rəsuli Əkrəmin: “Məni təbrik edin”, məni təbrik edin, çünki nübüvvət mənim Əhli-beytimin vilayəti ilə tamamlanır” dediyi gündür.

Qədir-Xum – Bütün dünya müsəlmanlarına “Siratəl-ləzinə ən əmtə əleyhim” ayəsi ilə bəxş olunan neməti-üzmadır.

Qədir-Xum – Haqqın cəmali-mövladə təcəllasıdır.

Qədir-Xum – “Mən küntü mövlahü fə həza Əliyyün Mövla” kəlamının qaynağıdır.

Qədir-Xum – Böyük din üləmalarının əsərlərində qeyd olunmuş tarixi həqiqətdir.

Qədir-Xum – Şuərayi-Əhıi-beytin, əhli-imanın əş’arından mədh olunmuşdur.

Qədir-Xum – Canlı şahidi olmuş şair Həssan ibn Sabitin qələmindən süzülmüşdür.

Qədir-Xum – Həzrət Peyğəmbərin Əmirəl-möminin Əli (ə) haqda etdiyi duanın bərəkətidir.

Qədir-Xum – “Allahümmə vali mən valah” – “İlahi, onun dostlarını dost tut” və “adi mən adah” – “düşmənlərini isə düşmən tut”, – kəlamının müjdəçisidir.

Qədir-Xum – “Vənsür mən nəsərəh” – ona kömək edənə kömək, “vəxzül mən xəzələh” – onu xar etmək istəyənin xar olmağıdır.

Qədir-Xum – “Bəxxun, bəxxun” – deyən bəzilərinin xəyanətinin açıq-aşkar ortaya çıxarıb ifşa edənidir.

Qədir-Xum – İki imamın, iki günəşin, iki ayın, iki ulduzun, iki nurun, birləşib cilvələnməsidir.

Qədir-Xum – İki nurun cəmalında 14 məsumun təqdimatıdır.

Qədir-Xum – Vilayətin ilk şəhidi Xanım Fatimeyi-Zəhranın (s.ə) şəhadətinin sirridir.

Qədir-Xum – Allahın əlindən təcəlla edən nurun, Kərbəla ələmdarının qollarının intiqamının işarəsidir.

Qədir-Xum – İmam Həsən (s) və İmam Hüseynin (ə) qəsb olunmuş haqlarının ibtida mərhələsidir.

Qədir-Xum – Fədəkin bağlı qalmış qapılarının açarıdır.

Qədir-Xum – Ali-əbanın və Aşuranın ayrılmız hissəsidir.

Qədir-Xum – Bu həqiqət haqqın səsi, Kərbəla qəhrəmanı cənab Zeynəbin (ə) qələbəsidir.

Qədir-Xum – İmam Mehdinin həsrəti, iftixarı və intizarıdır.

Qədir-Xum – Həzrəti-Mehdinin ilk təqdim etdiyi ədalət şüarıdır.

Qədir-Xum – Ələmində "Əliyyün vəliyyullah" yazılan, belində Zülfüqar asılan, əlində Əmirəl-mömininin tərtib etdiyi "Quran" olan Həzrəti-Hüccətin (ə) zühur etdiyi an dediyi "Mən zühur etmişəm ki, sizə Mövla Əlini (ə) tanıtdırım, çünki siz onu layiqincə tanımamısınız" kəlamının təsdiqidir.

Bu deyilənlərdən belə aydın olur ki, Qədir-Xum həqiqəti gizlətmək, təhrif etməkdən ötrü Novruz günü kimi

uzun illər unutdurulmuş və müxtəlif qadağalara məruz qalmışdır.

## “QƏDİR-XUM”

## PEYĞƏMBƏRİN DİLİNDƏN

Ey müsəlmanlar, edibdir əmr peyğəmbər sizə,
Şahi-din olsun Əmirəl-möminin Heydər sizə.

Olmasa əldə silah, olsa əgər düşmən dəniz,
Tək Əli bəsdir, gərəkməz min qoşun-ləşkər sizə.

Siz ürəkdən bağlana bilsəz o mahi-ənvərə,
Əskik etməz nurunu həm ol məhi-ənvər sizə.

Daimi olmaq dilərsiz, Şahi-Mərdani tutun,
Çün müdam qalmaz bu var-dövlət, gözəl dilbər sizə.

Qaldıra bilməzsiz aləmdə Əlinin bayrağın,
Cani-dildən olmayınca Kərbəla səngər sizə.

Tapdasaz həqqin Əlinin, ya ona ağ olsanız,
İstifadə eyləyib qan uddurar kafər sizə.

Əl uzatmaq da ona vacib deyil, ismi yetər,
Harda olsaz, əl tutar, çün ol mələk-mənzər sizə.

Hər bəladən sizləri zikri-Əlidir saxlayan,
"Ya Əli" söylər açanda Cəbrəil şəhpər sizə.

Mən Əlini ali bildim əmr alıb meracdə,
Şahi-Mərdanı Xuda təyin edib rəhbər sizə.

Mən Əliyə aşiqəm, yoxdur cahanə rəğbətim,
Çox gözəl mirasdı bu, gəl, öyrədim əzbər sizə.

Ta qiyamət mən Əli təbliğini əmr etmişəm,
Bu səbəbdən də Hacı Soltan açıb dəftər sizə.

## MÜSTƏZAD

Təbrik bu günə, çünki bu gün Əhmədi Muxtar,
aləmlərə sərvər.
Bəlli eliyibdir ki, bilün Heydəri-Kərrar,
oldu sizə rəhbər.
Xummi-Qədirə yetdi edib hamıya izhar,
hər ayəni əzbər.
"Ma ünzilə" ayatini o söylədi təkrar,
tökdi düri-şəkkər.
"Əlyövm"ədə İslamı açıb sahibi-əsrar,
şahid ola səflər.
"Əkməltü"də kamil Əlinin adıdı aşkar,

matdır buna kafər.
“Mən küntü”də “Mövla” sözünü qadiri-qəffar
dinə dedi məhvər.
Bayram qəbul etdi o günü cümleyi-zəvvar
birlikdə sərasər.
Kim eyləsə bu hadisəni dəhridə inkar,
duzəx onu gözlər.
Soltan, Əli haqqın tanıt, ol həqqə tərəfdar,
et xalqı münəvvər.
Açmış bizə bu barədə hər mübhəmi əxbar,
Şahdır bizə Heydər.

## ŞAH İSMAYIL XƏTAİDƏN TƏXMİS

Ey könül, cövlanə gəl bir ali meydandır bu gün,
Ya sevincdən, ya kədərdən gözləri qandır bu gün.
Yarımə can verməyim çün əhdü peymandır bu gün,
“Ey mənim çox sevdiyim aləmdə sultandır bu gün,
Yar əgər qəbul edər canımi, qurbandır bu gün”.

Mürtəza eşqilə sabitdir dəmadəm hali-dil,
Çün bu meyar ilə olmuş bəlli aşiqlik əsil.
Möminin cənnət məqamı amma bu dünya deyil,
“Sən, ey Adəm, aqil isən, dünyayə vermə meyil,
Dünyayə verən könül bu yolda nadandır bu gün”.

Bu günün xeyrin bilən hər kimsə xöşbəxtlik bulur,
Bəhri ümman tək gözi sevdalı sellərlə dolur,

Kim Əmirəl-mömininə həqq deməz, əlbət, solur,
"Əlini həqq bilməyənlər kafiri-mütləq olur,
Dini yox, imanı yox, çün namüsəlmandır bu gün".

Kim Əli adın tutar, imanı birdir, eşqi bir,
Axirət zindan olur hər şəxsə, olsa bi bəsir.
Sən də gəl, şeytan yox, insan tək çalış, hər qəlbə gir,
"Bir könül alur isən, yüzünə varmış kimidir,
Bir könül yıxar isən gər, Məkkə virandır bu gün".

Soltanın, var isə əqlin, gəl sözini tani, gör,
Hər sözündə istinad etsən, düzini tani, gör.
Var isə sidqin sənin, həqqin izini tani, gör,
"Ey Xətai, can qənimətdir, özini tani, gör,
Danla gün təndən çıxar, ol canki mehmandır bu gün".

## MÜBAHİLƏ GÜNÜ

Bu gün "Mübahilə" günü olmaqla yanaşı, eləcə də "Vilayət" ayəsinin ("Maidə"55) nazil olduğu gündür. İlk öncə qısaca olaraq "Vilayət" ayəsindən bəhs edib, sonra isə "Mübahilə" ayəsi barədə geniş və dolğun məlumat verəcəyik. Qurani-Kərim "Vilayət" ayəsində Həzrəti-Əlini (ə) Allah dostlarından biri kimi təqdim edir və bu ayədə onun möminlər üzərində rəhbər olmasını buyurur.

إِنَّمَا وَلِيُّكُمُ اللهُ وَرَسُولُهُ وَالَّذِينَ آمَنُواْ الَّذِينَ يُقِيمُونَ الصَّلاَةَ وَيُؤْتُونَ الزَّكَاةَ وَهُمْ رَاكِعُونَ

"Sizin rəhbəriniz yalnız Allah, onun Rəsulu və iman gətirib namaz qılaraq rüku halında zəkat verən şəxslərdir."[1]

Ayənin şəni-nüzulu belədir:

İmam Əbu-İshaq Sələbi "Əl-Kəbir" adlı təfsirində Əbuzər Qəffaridən belə nəql edir: "Mən bu iki qulağımla eşitdim, yalan desəm, hər ikisi də kar olsun və bu iki gözümlə gördüm – yalan desəm, hər ikisi də kor olsun ki, Həzrəti-Peyğəmbər (s) belə buyurdu: "Əli möminlərin rəhbəri, kafirləri öldürəndir. Ona kömək edən (Allahdan) kömək görər, onu yalqız buraxan (Allah tərəfindən) yalqız buraxı-

[1] "Maidə" surəsi, ayə 55

lar." Bilin ki, mən Həzrəti-Peyğəmbərlə (s) birlikdə namaz qıldığım bir gün bir sail məsciddə xalqdan yardım dilədi. Amma heç kim ona bir şey vermədi. Həzrəti-Əli (ə) isə ruku halında idi, üzük olan orta barmağını sailə tərəf uzatdı. Həmin sail gəlib Əlinin (ə) barmağındakı üzüyü çıxartdı. Bu vaxt Həzrəti-Peyğəmbər (s) Allaha yalvararaq belə dua etdi: "Ey Allahım! Qardaşım Musa sənə dua edərək dedi: "Ey Rəbbim, mənim köksümü aç, işimi asanlaşdır, dilimdəki, düyünü aç ki, sözümü başa düşsünlər və mənim öz əhlimdən olan qardaşım Harunu mənə köməkçi et, onunla qüvvətləndir və onu mənim işimə şərik et ki, sənə çoxlu təsbih və zikr edək. Heç şübhəsiz, sən bizim (halımızı) ən yaxşı görənsən." Sən isə ona: "Ey Musa, duan qəbul edildi və istəyin verildi" deyə vəhy etdin. Ey Allahım, mən də sənin bəndən və Peyğəmbərinəm; Sən mənim də köksümü aç, işimi asanlaşdır və mənim öz əhlimdən olan Əlini mənə vəzir (xəlifə, köməkçi) təyin et, onunla məni qüvvətləndir."

Əbuzər (ə) sözünə belə davam edir: "Allaha and olsun ki, hələ Peyğəmbər (s) sözünü qurtarmamışdı ki, Cəbrail (ə) nazil olub bu ayəni gətirdi: "Sizin dostunuz, rəhbəriniz ancaq Allah, onun elçisi və namaz qılarkən ruku halında zəkat verən möminlərdir."

Hər kim Allah, onun elçisi və möminlərlə dostluq etsə, bilsin ki, Allahın firqəsi qələbə çalacaqdır."

Sünnülərin "Sihah" və "Müsnəd" kitablarında nəql etdikləri rəvayətlərdə aydın şəkildə qeyd olunur ki, bu ayə Əlinin (ə) öz üzüyünü ruku halında sailə (fəqirə) verdiyi

zaman nazil olmuşdur. Peyğəmbərin (s) zamanında yaşayan və gözəl təbə malik olan şair Həssan İbni-Sabit bu hadisəni belə nəzmə çəkir.

و انت الذی اعطیت اذ انت راکعٌ
فدتک نفوس القوم یا خیر راکعٍ
فانذل فیک الله خیر ولایةٍ
وبینهما فی محکمات الشّرائعِ

"Sən o kəssən ki, ruku halında bəxşiş etdin, canlar sənə fəda olsun, ey ruku edənlərin ən yaxşısı! Allah ən yaxşı vilayəti sənin barəndə nazil etdi və onu şəriətin xələl yetməyən hökmlərində bəyan etdi."

Bu ayənin şəni-nüzulu ilə əlaqədar olan sənədlər həddindən artıq çoxdur.[1]

Mövlana Məhəmməd Füzuli bu ayəni belə nəzmə çəkmişdir:

*Üzük bəxş eyləmişsə sailə ol şəh namaz üstə,*
*Əlində əhli-həqqin hər nə varsa, nəzri-saildir.*

Müasir şairlərdən biri olan Namiq Kamal Dərbəndi də bu ayəni belə qələmə almışdır:

[1] "Təfsiri-Təbəri", 6-c., səh.186; "Təfsiri-Beyzavi", cild 1, səh.345; "ddürrul-Mənsur", cild 2, səh.293 və s.

*Sailə etdin əta şövqilə əngüştərini,*
*Heyranam taətinə, etdiyin ehsanə, Əli.*

Məddah Hacı Yaşar Cahid də "Olmaz idi" rədifli qəzəlində Həzrəti-Əlinin (ə) bu şücaətini cox incə şəkildə qələmə almışdır:

*Verdin əngüştərini sailə əsnayi-namaz,*
*Kimsə əshabidə bir böylə səxa olmaz idi.*

"Dədə Qorqud" dastanında Qurani-Kərimin xüsusi fəzilətlərə malik "Ən-nəbə" və "Ya-sin" surələri zikr olunur. Dastanda Əhli-beyt (ə), xüsusən, Həzrəti-Əlinin (ə) vilayəti barədə buyurulur: "Qılınc çaldı, din açdı mərdlər şahı Əli − əhsən".

Həzrəti-Əli (ə) Peyğəmbərdən (s) sonra həm kəlamı, həm də qılıncı ilə dinimizı qüvvətləndirən və şöhrətləndirən, şücaəti, səbri, təqvası ilə islamı yaşadan ikinci böyük şəxsiyyət idi. Dastanda "Ən-nəba" və "Ya-sin" surələri barədə deyilir:

*Quranın son fəslində "Əmmə" surəsi gözəldir!*
*Höccətlənib düz oxunsa, "Ya-sin" gözəldir!*

Təfsir alimlərinin fikrincə, "Əmmə" surəsində Məad – Qiyamət günü olsa da, Peyğəmbər (s) surənin əvvəlinci iki ayəsinin təfsirində "Onlar (müşriklər) bir birindən nə haqda soruşurlar?", "Böyük bir xəbərdən (Qiyamət günü

haqqında)" belə buyurmuşdur: "Böyük xəbər" Əlinin vilayət məsələsidir ki, bu barədə bütün insanlardan qəbr evində də soruşulacaqdır.

İslam Peyğəmbəri Həzrəti-Mühəmməd (s) buyurub: "Bu'isə əliyyun mə-əl-ənbiyəi sirran və məiyə cəhran"- Əli(ə) bütün Peyğəmbərlərin yaninda gizli idi, amma mənim yanimda aşkar oldu".

(İbn Əbi "Cumhurul-əhsai fil-məcəllə" səh.309; Əhməd-Ərrəhmani Əlhəmədani "Fil-İməm Əli" səh.86; Seyyid Haşim Əlbəhrani "Fi ğayətil-məram"cild.3 səh.17).

Peyğəmbərmizin (s) bu mübarək hədisinə bir çox şairlərin yaradıcılığında rast gəlirik. Misal olaraq müasir dövrümüzün şairlərindən olan Vuqar Sabitin "Əli (ə)" rədifli qəzəlində olan bu beytə nəzər yetirək:

*Dövri-Adəmdən bəri yar oldun hər Peyğəmbərə,*
*Olmusan sahib-vilayət zahir, həm ixfa Əli!*

## MÜBAHİLƏ AYƏSİ

Zilhiccə ayının 24-ü (Avqustun 26-i) "Mübahilə" günüdür. (Mübahilə – iki nəfərin bir-birinə qarşı nifrin və qarğış etməsi.) Peyğəmbəri-Əkrəmin (s) Həzrəti-İsanın (ə) allahlıq məqamında şərik olduğunu iddia edən Nəcran xristianları ilə mübahisəsi nəticə vermədikdə, "Ali-İmran" surəsinin 61-ci ayəsi nazil oldu:

**فَمَنْ حَآجَّكَ فِيهِ مِن بَعْدِ مَا جَاءكَ مِنَ الْعِلْمِ فَقُلْ تَعَالَوْاْ نَدْعُ أَبْنَاءنَا وَأَبْنَاءكُمْ وَنِسَاءنَا وَنِسَاءكُمْ وَأَنفُسَنَا وأَنفُسَكُمْ ثُمَّ نَبْتَهِلْ فَنَجْعَل لَّعْنَةُ اللّهِ عَلَى الْكَاذِبِينَ**

"(Ya Peyğəmbər!) Hər kəs (İsa barəsində) sənə elm gəldikdən sonra səninlə mübahisə etsə, onlara de: "Gəlin biz də oğullarımızı, siz də oğullarınızı; biz də qadınlarımızı, siz də qadınlarınızı; biz də özümüzü, siz də özünüzü çağıraq! Sonra mübahilə edib (yalvarıb qarğış edərək) yalançılara Allahdan lənət istəyək."

Bu ayə nazil olduqdan sonra Peyğəmbəri-Əkrəm (s) Nəcran xristianlarını mübahiləyə çağırdı və təyin olunan gün (mübahilə günü) Peyğəmbəri-Əkrəm (s) Əli (ə), Fatimə (ə.s), Həsən (ə) və Hüseynlə (ə) birlikdə xristianların qarşısına çıxdı. Xristianlar Peyğəmbəri-Əkrəmin (s) az sayda (yəni öz yaxınları və sevdikləri ilə) mübahiləyə gəl-

diyini görüb o Həzrətin haqq olduğunu düşündülər, mübahilə etməkdən qorxub sülh edərək cizyə (vergi) verməyə razılaşdılar.

"Nəbtəhil" sözü "ibtihal" sözündən olub dua üçün əlləri səmaya açmaq mənasını bildirir. Bu səbəbdən də mübahilə ayəsi kimi tanınmışdır. Mübahilə iki müxalif qrupun Allah dərgahına üz tutub yalançı hesab etdiyi qarşı tərəfə lənət istəməsidir.

Şiə və sünni təfsirlərində, eləcə də, bəzi hədis və tarix kitablarında oxuyuruq ki, hicri 10-cu ildə bir qrup şəxs Həzrəti-Peyğəmbər (s) tərəfindən Yəmənin Nəcran məntəqəsində İslamı təbliğ etmək əmri aldı. Bu vaxt Nəcran məsihiləri də İslam peyğəmbəri (s) ilə söhbət üçün Mədinəyə heyət göndərdilər. Həzrəti-Peyğəmbərlə (s) yetərincə söhbət etmələrinə baxmayaraq, yenə bəhanə gətirib, İslamın haqq olmasını təsdiqləmədilər. Ayə nazil oldu və Peyğəmbərə (s) buyuruldu: «Səninlə höcətləşənlərə, haqqı qəbul etmək istəməyənlərə de ki, övladlarımız, qadınlarımız və özümüz Allahı çağıraq və yalançıya lənət istəyək. Kim Allahın lənətinə gəlsə, onun da yolunun batilliyi məlum olsun. Bu yolla söz-söhbətə, mübahisələrə son qoyaq...»

Həzrəti-Peyğəmbərin (s) mübahilə təklifini eşidən Nəcran məsihiləri bir-birlərinə baxıb səslərini çıxarmadılar. Sonra möhlət istədilər ki, bu barədə düşünsünlür. Məsihilərin başçısı onlara dedi: «Siz təklifi qəbul edin. Əgər görsəniz ki, Məhəmməd (s) səs-küy və böyük bir cəmiyyətlə gəlir, nigaran olmayın və əmin olun ki, qorxu yoxdur. Yox

əgər meydana az sayda adamla gəlsə, mübahilə məsələsindən çəkinin və onunla sülhə gəlin.

Təyin olunmuş mübahilə günü məsihilər İslam Peyğəmbərinin (s) iki körpə, bir gənc və bir qadınla gəldiyini gördülər. Bu iki körpə Həsən (ə) və Hüseyn (ə), gənc isə Əli ibn Əbi Talib (ə) idi. Həzrətin yanındakı qadın onun qızı Həzrəti-Fatimə (s) idi. Məsihi keşişi dedi: «Mən elə çöhrələr görürəm ki, dağın öz yerindən oynamasını Allahdan istəsələr, bu iş olar. Əgər onlar nifrin etsələr, yer üzündə bircə nəfər də olsun, məsihi qalmaz...» Ona görə də mübahilədən imtina edib məsləhətləşmək qərarına gəldilər. Həzrət i-Peyğəmbər (s) buyurdu: «And olsun haqq olaraq məni peyğəmbər seçənə, əgər mübahilə baş tutsaydı, həmin vadi onları alova bürüyərdi». 2

Bu macəra təkcə şiə mənbələrində yox, həm də mötəbər sünni mənbələrində nəql olunmuşdur.

Mübahilə günü zilhiccə ayının 24 və ya 25-ci gününə təsadüf edir. Peyğəmbər (s) dövründə Mədinə kənarında olan mübahilə məhəlli hazırda şəhərin daxilindədir. Həmin yerdə Məscidül-İcabə adlı bir məscid tikilmişdir. Bu məscidlə peyğəmbər məscidi arasında təqribən iki kilometr məsafə var.

“Əl-mizan” təfsirində nəql olunmuş rəvayətə əsasən, Peyğəmbər (s) yalnız məsihiləri yox, həm də yəhudiləri mübahiləyə dəvət etmişdi.

Mübahilə təkcə peyğəmbər dövrünə aid deyil. Bəzi rəvayətlərə əsasən, başqa möminlər də mübahilə edə bilərlər. İmam Sadiq (ə) bu barədə göstərişlər vermişdir.

Sual: Bu hadisədə yalnız Həzrəti-Fatimə (s) iştirak etdiyi halda, nə üçün «qadınlar» sözü Quranda cəm formada işlədilmişdir?

Cavab: Quranda bir çox hallarda Allah bir nəfəri cəm formada yad edir. Məsələn "Ali-İmran" surəsinin 181-ci ayəsində nəql olunur ki, bir şəxs Allahı kiçiltmək məqsədi ilə dedi: "Allah fəqirdir", amma ayənin ərəbi mətnində bu cümlə cəm formada işlədilmişdir. Quranın digər bir ayəsində Həzrəti-İbrahim haqqında buyurulur: "İbrahim bir ümmətdir", halbuki İbrahim tək bir şəxs idi.

Peyğəmbər (s) mübahilə günü qarşı tərəfə nifrin üçün tək də gedə bilərdi. Amma Allah və Onun rəsulu bu işlə bizə anladır ki, bu şəxslər haqqa dəvətdə Allah rəsulunun yardımçıları və şərikləridirlər. Onlar təhlükəni Peyğəmbərlə (s) birlikdə qarşılayır və onun hərəkətini davam etdirirlər.

Ayətullah Möhsün Qiraəti "NUR TƏFSİRİ" Bakı-2014 (I-II cild.səh.435-437)

## MÜBAHİLƏ GÜNÜNÜN ƏMƏLLƏRİ

İslamın qələbə çaldığı bu şərəfli gününün özünəməxsus bir neçə əməli var:

1. Qüsl etmək (Mübahilə gününün qüslü niyyətilə);
2. Oruc tutmaq;
3. Günorta azanından öncə iki rükət namaz qılmaq: hər rükətdə "Həmd" surəsindən sonra on dəfə "İxlas" surəsi, on dəfə "Ayətül-kürsi" və on dəfə "Qədr" surəsi oxunmalıdır. ("Ayətül-kürsü"nü "Hum fiha xalidun" ayəsinə qədər oxumaq tövsiyə olunur və bu namaz "Qədir-Xum" bayramı gününə məxsus namazla eynidir.)
4. "Mübahilə" gününün namazından sonra yetmiş dəfə "istiğfar" etmək (tövbə edib Allahdan günahların bağışlanmasını diləmək);
5. Ramazan ayının "Səhər" duasına oxşar olan "Mübahilə" duasını oxumaq:

**Oxunuşu:** Əllahummə inni əs\`olukə min bəhaikə biəbhahu, və kullu bəhaikə bəhiyy. Əllahummə inni əs\`olukə bibəhaikə kullih. Əllahummə inni əs\`olukə min cəlalikə biəcəllihi, və kullu cəlalikə cəlil. Əllahummə inni əs\`olukə bicəlalikə kullih. Əllahummə inni əs\`olukə min cəmalikə biəcməlihi, və kullu cəmalikə cəmil. Əllahummə inni əs\`olukə bicəmalikə kullih...

**Tərcüməsi:** İlahi, Sənin Öz nurlu dərəcələrinin nura-

niyyətinin haqqına and verib Səndən istəyirəm, bir halda ki, onun bütün dərəcələri nuranidir. İlahi, Sənin nuraniyyətinin bütün dərəcələrinin haqqına and verib Səndən istəyirəm! İlahi, Sənin şövkətinin ən ali dərəcəsinin haqqına and verib Səndən istəyirəm, bir halda ki, Sənin şövkətinin bütün dərəcələri alidir! İlahi, Sənin şövkətinin bütün dərəcələrinin haqqına and verib Səndən istəyirəm! İlahi, Sənin camalının ən ali dərəcəsinin haqqına and verib Səndən istəyirəm, bir halda ki, Sənin camalının bütün dərəcələri alidir! İlahi, Sənin camalının bütün dərəcələrinin haqqına and verib Səndən istəyirəm...

6. Yoxsullara yardım etmək və sədəqə vermək;

7. "Camiə Kəbirə" ziyarətnaməsini oxumaq.

*Şeyx Abbas Qummi, "Məfatihul-cinan", "Zilhiccə ayının əməlləri" bölümü.

**Mübahilə hadisəsi**

Ayətullahul-uzma Şeyx Vəhid Xorasani "Mübahilə" ayəsi və onun qısa izahı barədə deyir: "Mübahilə günü Allahın höccətini Peyğəmbərə tamam etdiyi, İmam Əlinin (ə) fasiləsiz xilafətini və Əhli-Beytin (ə) ismətini isbat etdiyi gündür. Ümmətin alimləri icma etmişlər ki, mübahilə ayəsində keçən "əbnaəna" (övladlarımızı) sözündən məqsəd Həzrəti-Həsən və Həzrəti-Huseyn (ə), "nisaəna" (qadınlarımızı) sözündən məqsəd Xanım Zəhra (s.ə), "ənfusəna" (özlərimizi) sözündən məqsəd Peyğəmbər (s) və İmam Əlidir (ə).

Əhli-sünnə alimi Zəməxşəri deyir: "Mübahilə ayəsində

Kisa əhlinin (Əhli-beytin) fəzilətinə dair güclü dəlil, Peyğəmbərin (s) nübüvvətinin səhihliyinə aşkar dəlil vardır. Çünki, şiə və sünnilərdən heç kəs nəsranilərin Peyğəmbərin (s) dəvətini qəbul etməsini rəvayət etməmişdir. Peyğəmbər (s) onları Allahın doğulmadığı və doğmadığına dair tovhidə dəvət etdikdən və onlar da "Həqiqətən, Allah yanında İsanın məsəli Adəmin məsəli kimidir. Allah onu torpaqdan yaratdı, sonra isə ona "Ol!"– dedi, o da oldu" (Ali-İmran, 59) ayəsinə iman gətirməkdən üz döndərdikdən sonra Peyğəmbər (s) onları mübahiləyə dəvət etdi ki, Allahın yalançılara lənət etməsiylə haqq batildən ayrılsın".

Peyğəmbər (s) İmam Huseyni (ə) öz ağuşuna aldı və İmam Həsənin (ə) əlindən tutdu. Peyğəmbərin (s) arxasınca isə Xanım Zəhra (s.ə) və ondan sonra İmam Əli (ə) dua etmək üçün gəldilər. Nəsranilərin böyük keşişi bu mənzərəni gördükdə dedi: "Elə çöhrələri görürəm ki, əgər onlar Allahdan dağı yerindən qaldırmasını istəsələr, Allah onların duasını qəbul edər. Əgər onlarla lənətləşsəniz qiyamət gününə qədər nəsranilərdən bir nəfər belə yer üzündə qalmayacaqdır". Nəsranilər təslim olmaq və cizyə vermək zillətini qəbul etdilər və məsihiyyət dininin üzərindən batillik xətti çəkildi.

## “MÜBAHİLƏ”NİN ƏHƏMİYYƏTİ

“Mübahilə” hadisəsi İslam Peyğəmbərinin (s) risalət və peyğəmbərliyinin doğru və haqq olduğunu göstərən aydın bir nişanə və dəlildir. Çünki Allahla qəti və mənəvi əlaqəsi olmayan şəxsin belə təhlükəli işə razı olması mümkün deyildir. Peyğəmbəri-Əkrəm (s) çəkinmədən müxaliflərinə deyir ki, gəlin, birlikdə dua edib Allahdan yalançıları rüsvay etməsini diləyək. Bunun mənası odur ki, sözsüz, mənim nifrin və qarğışım sizi tutacaq və siz bunun nəticəsini görəcəksiniz!

Şübhəsiz, belə bir meydana girmək asan iş deyil; əgər qarğış Allah dərgahında qəbul olunmasa və qarşı tərəf cəzasına çatmasa, bu özü böyük rüsvayçılıq olar. Heç bir ağıllı insan qarşı tərəfin məğlub olacağına inanmadan belə bir işə əl atmaz. Məhz bu səbəbdən də, rəvayətlərdə deyildiyi kimi, mübahilədən söz düşdükdə, Nəcran xristianları Peyğəmbəri-Əkrəmdən (s) bir qədər fikirləşmək üçün möhlət istədilər. Onlar Peyğəmbərin (s) özü ilə gətirdiyi şəxslərin yalnız dörd nəfərdən ibarət olduğunu, səs-küy salmadan, qəti inam və xatircəmliklə vəd edilmiş yerə gəldiyini gördükdə, dəhşətə gələrək mübahilədən boyun qaçırdılar və o Həzrətin haqq olduğuna inanmaqla əzabdan amanda qaldılar.

Digər tərəfdən bu ayə Peyğəmbərin (s) Əhli-beytinin (Əli, Fatimə, Həsən və Hüseynin (ə)) yüksək məqama malik olduğunu göstərən ən aydın və möhkəm sübutdur. Şübhəsiz, ayədə qeyd olunan “əbnaəna” (oğullarımız) sözündə məqsəd imam Həsən və imam Hüseyn (ə), “nisaəna” (qadınlarımız) sözündə məqsəd Fatimeyi-Zəhradır (ə.s). “Ənfüsəna” (özümüz) sözünə gəldikdə isə, şübhəsiz məqsəd təkcə Peyğəmbəri-Əkrəmin (s) özü deyil. Çünki ayədə “özümüzü dəvət edək” ifadəsi vardır ki, əgər yalnız Peyğəmbər (s) nəzərdə tutulsaydı, onda insanın öz-özünü dəvət etməsinin heç bir mənası olmazdı. Buna əsasən, yeganə yol budur ki, belə deyək: “Məqsəd Əlidir (ə)!”

“Mübahilə” ayəsinin təfsirində nəql olunan məşhur bir hədis insanın diqqətini özünə daha çox cəlb edir. Hədisdə deyilir: “Bir gün xəlifə Məmun Abbasi imam Rzadan (ə) “Baban Əli ibn Əbi Talibin (ə) Peyğəmbərin (s) xəlifəsi olmasına dəlilin varmı?” deyə soruşduqda, Həzrət (ə) buyurdu: “Ənfüsəna” ayəsi (buna dəlildir).”

Məmun dedi: “Əgər “nisaəna” olmasaydı (sözün düz olardı!)”

İmam Rza (ə) buyurdu: “Əgər “əbnaəna” olmasaydı (sən deyən olardı)!”

Əllamə Təbatəbai bu qısa və eyni zamanda mənalı sözləri şərh edərək yazır: “İmam Rzanın (ə) “ənfüsəna” ayəsinə istinad etməsinin səbəbi budur ki, Allah-təala Əlini (ə) Peyğəmbərin (s) canı və nəfsi kimi tanıtdırmışdır. Buna əsasən, Əli (ə) xilafət və imamət məqamına hamıdan layiqdir, risalət və peyğəmbərlikdən başqa hər bir məqamın-

da Peyğəmbərlə (s) eynidir.

Məmunun cavabı isə buna bir növ irad idi. Belə ki, ayədə qeyd olunan "nisaəna" (qadınlarımız) sözü göstərir ki, "ənfüsəna" sözü Peyğəmbərin (s) canı və nəfsi kimi şəxsi deyil, ümumi olaraq "ricaləna" (kişilərimiz) mənasını bildirir.

İmam Rza (ə) da növbəti cavabı ilə bildirir ki, "ənfüsəna" "kişilərimiz" mənasını daşısaydı, artıq "əbnaəna" (oğullarımız) sözünə ehtiyac olmazdı. Çünki oğullar ifadəsi də kişi cinsinə daxildir. Buna əsasən, ayədəki "ənfüsəna" sözü "kişilərimiz" mənasında deyil.

*"Əl-mizan", 3-cü cild, səh. 230, "mübahilə" ayəsinin təfsiri.

"Biharul-ənvar" kitabında nəql olunur ki, Məmun imam Rzaya (ə) dedi: "Ola bilər ki, "ənfüsəna" (özümüz) sözü başqasına yox, yalnız Peyğəmbərin (s) özünə aid olsun."

İmam Rza (s) buyurdu: "Məgər insan özünü bir işə çağıra bilərmi? Peyğəmbər (s) Fatimə (ə.s), Həsən və Hüseyndən (ə) əlavə, Əlini (ə) də çağırdı. Buradan məlum olur ki, Əli (ə) Peyğəmbərin (s) canı və nəfsi kimidir!"
*"Biharul-ənvar", 10-cu cild, səh. 350)

Bu bölümü Həzrəti-Əli (ə) aşiqi Seyyid Məhəmmədhüseyn Şəhriyarın qəzəli və onun izahı ilə yekunlaşdırırıq:

*Əli, ey humayi-rəhmət, nə dəlilsən Xudayə*
*Ki, Xudadən özgə sayən nə ki var, edər himayə?!*
*Əgər aşinayi-həqsən, Əli ilə aşina ol,*
*Əli ilə olmuşam mən, könül, aşina Xudayə.(1)*

*Nə əsər qalır fənadən iki aləm içrə, billah,*
*Eləsə himayə hərgah Əli çeşmeyi-bəqayə!*
*Yenə rəhmətin buludtək yağa bəlkə, yoxsa duxəz*
*Qəzəb atəşiylə yeksər verər aləmi fənayə.*
*Yeri, döy Əli qapısın, odur, ey gədayi-miskun,*
*Kərəmiylə padşahlıq üzüyü verən gədayə. (2)*
*Kim öz oğluna deyər ki, qıl əsir ilə müdara,*
*Nola qatilimdi? Yüngül yetirin onu cəzayə. (3)*
*Kim Əli kimi əcayib elə bir oğul yetirdi*
*Ki, şərəf gətirdi yekər şühədayi-Kərbəlayə?!(4)*
*Edən aşina ilə əhd hamı paklər içində,*
*Əli tək olurmu sadiq qalan əhd ilə vəfayə?*
*Nə Xuda desəm səzadır, nə bəşər desəm rəvadır,*
*Necə versəm ad xətadır şəhi-mülki-lafətayə!(5)*
*İki qan saçan gözüm ki, qapısı qübarın istər,*
*Gətir, ey nəsimi-rəhmət, əvəz eylə tutiyayə.*
*Bu ümidlə ta ki, düşsün qədəmin qübarı üstə,*
*Nə sifariş rtdi sinəm odu hər qədəm səbayə?*
*Ver özün qəzayə təğyir fəqir duası ilə,*
*Canımız tərəf bir afət yolu olmasın qəzayə.*
*Nə gəlim nəvayə ney tək, necə şövqdən vurum dəm?*
*Ki, Lisani-qeyb dilkəş gətirir bunu nəvayə: (6)*
*“Budu hər gecə ümidim ki, məgər səhər nəsimi*
*Verə müjdə aşinadən, edə lütf aşinayə”.*
*Çağırırdı mürği-Yahəq gecə yarı Şəhriyarı,*
*Dur, ürək qəmin de yarə ki, məcaldır duayə!(7)**

*Tərcümə edəni: Mircəlal ZƏKİYEV

## ŞƏRHLƏR VƏ İZAHLAR

1.Həzrəti-Əli (ə) buyurmuşdur: "Ərəftu rəbbi birəbbi" (Allahımı Allahımla tanıdım). Şəhriyar da Allahı onun ecazkar bəndəsi olan Əli (ə) ilə tanıyır.

2.Burada şair Həzrəti-Əlinin (ə) namaz əsnasında dilənçiyə üzük bağışlamasına işarə edir. Bir gün o Həzrət (ə) məsciddə namaz qılırdı. Bir dilənçi məscidə gəlib orada olanlardan sədəqə istədi, lakin ona heç kəs bir şey vermədi. Dilənçi gəlib Əlinin (ə) yanında durdu. O Həzrət (ə) həmin vaxt rüku halında idi. Dilənçinin orada olduğunu duyub, sağ əlinin kiçik barmağındakı qiymətli üzüyü barmağının işarəsi ilə ona göstərdi. Dilənçi üzüyü onun barmağından çıxarıb apardı.

Bu zaman Cənabi-Cəbrail (ə) "Maidə" surəsinin 55-ci ayəsini Peyğəmbərə (s) nazil etdi: "Həqiqətən, sizin dostunuz Allah, onun Rəsulu (s), iman gətirib namaz qılan və ruku halında zəkat verən kəslərdir".

3.Lənətə gəlmiş İbn Mülcəm Həzrəti-Əlini (ə) yaralayandan sonra onu tutub həbs etmişdilər. Həzrəti-Əli (ə) ramazan ayının 19-da sübh namazı vaxtı zərbətlənib, ramazan ayının 21-də vəfat etdi. Sağ olduğu saatlarda tapşırırdı ki, qatilə əziyyət və işgəncə verməsinlər, onu ac qoymasınlar. Hətta özü yediyi yeməyin yarısını qatil üçün göndərirdi. Tapşırırdı ki, onu öldürəndə yalnız bir zərbə vurun,

çünki o, mənə bir zərbə vurub.

4.Həzrəti-Əli (ə) "Məzhərül-əcaib vəl-qəraib" (təəccüblü və qəribə işlərin zahir olduğu şəxs) ləqəbi ilə məşhurdur. Burada həmin ləqəbə işarə edilir.

5.Bu beytdəki "lafəta" sözü Həzrəti-Əlinin (ə) Xeybər müharibəsindəki şücaətinə işarədir. Həmin davada Əli (ə) Xeybər yəhudilərinin başçısı, nəhəng cüssəli Mərhəblə təkbətək döyüşdə öz Zülfiqar qılıncı ilə ona elə bir zərbə vurdu ki, Mərhəbin dəbilqəsi, daşdan yonulmuş papağı, zirehi və başı parçalandı. Bu halda asimandakı mələklər bu sözləri oxudular: "La fəta illa Əli, la seyfə illə Zülfiqar" (Əlidən başqa cavanmərd, Zülfiqardan başqa qılınc yoxdur). Bu sözləri bütün qoşun əhli eşitdi.

Mərhəbin qətlindən sonra yəhudilər qalaya çəkilib, qapını bağladılar. Əli (ə) qalanın qapısını çərçivədən qoparıb çıxardı və İslam qoşunu qalaya daxil olub, onu fəth etdi.

Müharibədən sonra müsəlman qoşunundan 40 nəfər qüvvətli kişi o qapını yerindən qaldıra bilmədi. Həzrəti-Əlidən (ə) qapını necə qopardığını soruşanda, belə cavab verdi: "Mən o qapını bəşəri qüvvə ilə deyil, ilahi qüvvə və qiyamət gününə imanla qoparıb qaldırdım".

6. "Lisanül-qeyb" (qeyb dili) Hafiz Şirazinin ləqəbidir. Bundan sonrakı beyt Hafizin eyni bəhr və qafiyə ilə dediyi qəzəlindəndir.

7. Əfsanəyə görə, "Ya həqq" gecələr oyaq qalıb, sübhə qədər "həq-həq" deyə nalə edən bir quşdur.

## *İstifadə olunmuş ədəbiyyat*


1. Qurani-Kərim. (Ərəb dilindən tərcümə edənlər: Z.M.Bünyadov, V.N.Məmmədəliyev). Bakı-2005.
2. Qurani-Kərimin Azərbaycan dilinə tərcümə və izahı. Ayətullah -üzma Nasir Məkarim Şirazi. Bakı-2017.
3. Həzrəti-Əli (ə).“Nəhcül-bəlağə”.(Toplayan, tərcüməçi və şərhçi Seyyid Rəzi. 2 clddə. Bakı-2017.
4. Nizami Gəncəvi. Xəmsə. Bakı-“Gənclik”-1981.
5. İmadəddin Nəsimi. Seçilmiş əsərləri. Bakı, Azərbaycan Dövlət Nəşr.,1973.
6. Şah İsmayıl Xətai. Keçmə namərd körpüsündən. Bakı-“Yazıçı”-1988.
7. Məhəmməd Füzuli. Seçilmiş əsərləri. Bakı-“Yazıçı”-1984.
8. Seyyid Əzim Şirvani. Seçilmiş əsərləri. 3 clddə, I c. Bakı-1967.
9. Seyyid Əbülqasim Nəbati. Seçilmiş əsərləri. Bakı-“Yazıçı”-1985.
10. Məhəmmədtəqi Qumri Dərbəndi. Kənzül-məsaib. Bakı-“Boz Oğuz”-1999.
11. Axund Hacı Soltan. Azərbaycan dərviş və rövzəxanları. Bakı-“Ozan”-1998.
12. Axund Hacı Soltan. Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı. Bakı-“Tural-Ə” NPM.-2001
13. F.Cəfakeş. Qəzəllər. Bakı-“Zaman”-1998.


Əlavə ədəbiyyatları daxil et!